*Mən Aşıq dağ itdi,*
*Duman gəldi, dağ itdi.*
*Biz də bir oymaq idik,*
*Fələk vurdu dağıtdı.*
**Sarı Aşıq**




**№2(2)**
**Avqust, sentyabr 2011**

NURLAR
BAKI – 2011

**Laçın yurdu, №2(2), 2011**
**Bakı, "Nurlar", 2011. 96 səh.** 



Redaksiyanın ünvanı:
**Mətbuat pr., 529-cu məhəllə**

Əlaqə:
**Tel.: (070) 956 36 22, (050/055) 362 03 60**
**e-mail: lachinyurdu@mail.ru**

Dərgidə dərc olunan yazılar müəlliflərin mövqeyini əks etdirir
və yazı müəllifləri məsuliyyət daşıyır.
Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı 5 saylı TURAN şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı: **0137010002944**,
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**33821019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **CITIUS33**,
International Bank of Azerbaijan Republic Yasamal Branch
kod: **805142**
USD only Account #:
**33822018403136196216**
**Mammadov Arif Kamran**
INN**: 1401771462**

**Bu sayımızda**

*Qarabağ qaziləri*



*Kimlər keçdi bu dünyadan*



*Nəsil şəcərəsi*



*İdmançılarımız*



*Şəhidlərimiz*



*Publisistika*



*Poeziya*

## BAŞ REDAKTORDAN

Əziz oxucular, böyük məmnunluqla "Laçın yurdu"nun 2-ci sayını da sizlərə təqdim edirik. Bu dəfə hüzurunuza etirafla gəlmişik. İlk sayımızda işlətdiyimiz "heç kəsin kitabını heç kim oxumur" ifadəsindən imtina etmək məcburiyyətindəyik. Sən demə, kiminsə kitabını kimlərsə oxuyurmuş. Cəmi 500 tirajla çap olunan jurnala bu qədər tələbat olacağını, doğrusu, gözləmirdik. Metro stansiyalarında və digər satış nöqtələrində jurnalımızın bir nüsxəsinin də qalmaması qəlbimizi qürur hissi ilə doldurdu, yalnız bizdən jurnal istəyən dost-tanışın xahişini yerinə yetirə bilmədiyimizə görə təəssüfləndik. Çoxsaylı telefon zəngləri, oxucu məktubları bizi daha da ruhlandırdı. Təbii ki, haqlı iradlara da anlayışla yanaşdıq, indən belə də bütün tənqidi fikirləri səmimiyyətlə qarşılayacağıq.

Mütləq onu da diqqətə çatdırmalıyıq ki, ünvanımıza gələn yazılara qarşı tələbkarlığımızın dozası xeyli aşağıdır. Bu isə səbəbsiz deyil. Ən azı sözü qiymətləndirməyi bacaranların, düşüncələrini, duyğularını qələmə alıb çap etdirmək arzusunda olanların üzünə qapımızı həmişə açıq saxlayacağıq. Çünki onların yazıdan-yazıya püxtələşəcəklərinə inanırıq.

Müəlliflərdən bir təvəqqəmiz də var. Ayrı-ayrı şəxslər barədə yazarkən şişirtmələrə, təhriflərə yol verməsinlər. Xüsusilə unutmayaq ki, ötən əsrin 20-ci illəri o qədər də uzaq tarix deyil. O dövrün hadisələri, əsl gerçəkliklər, kimin hansı ideologiyaya xidmət göstərməsi hələ yaddaşlardan silinməyib. Ona görə də fərqli təqdimat əks effekt yaradır. Bəzən insanın layiq olduğu səviyyədən artıq təriflənməsi istehzaya çevrilir, "qaş düzəltmək əvəzinə göz çıxarmaq"la nəticələnir.

Yeri gəlmişkən, bir məsələyə də aydınlıq gətirək: bəzən hansısa mətbuat orqanında, saytda işıq üzü görən materialları "Laçın yurdu"nun səhifələrinə yerləşdirməyimizin yazı qıtlığı ilə bağlılığı yoxdur. Bu, sadəcə olaraq Laçına, laçınlılara aid məlumatları ictimailəşdirmək məqsədi daşıyır.

Hörmətli oxucular, sözü uzatmadan verdiyimiz vədə sadiqliyimizi xatırladırıq. Biz sizinlə əməkdaşlığa hər zaman hazırıq. Bu jurnal sizindir, istəklərinizi, təkliflərinizi, problemlərinizi bölüşmək hər birinizin haqqıdır.

Bir daha göstərdiyiniz diqqətə, həssaslığa görə redaksiyanın əməkdaşları adından sizlərə təşəkkürümüzü yetiririk. Növbəti sayımızda görüşənədək.

ANIM

# «ÖLSƏM ŞƏHİDƏM, QALSAM QƏHRƏMAN…»




Allah yolunda, dini, canı, malı, namus və şərəfi, Vətən və milləti uğrunda ölənlərə şəhid deyilir. Vətəni və milləti uğrunda döyüşərək müqəddəs şəhidlik zirvəsinə ucalan qəhrəman oğullarımızdan biri də avqustun 20-də 45 yaşı tamam olan Azərbaycanın Milli Qəhrəmanı, şəhid Fazil Mehdiyevdir.

Şəhidlər Allahın hüzuruna diri olaraq getdiklərinə, sorğusuz-sualsız cənnətə girəcəklərinə, şahidlik olunduğu üçün bu adı alıblar. Qurani-Kərimdə belə buyrulur: «Allah yolunda öldürülənlərə ölülər deməyin, onlar ölü deyil, diridirlər, lakin siz (o yüksək həyatın) fərqində deyilsiniz» (Bəqərə, 154).

Fazil Umud oğlu Mehdiyev 20 avqust 1966-cı ildə Laçın rayonunun Ələkçi kəndində anadan olub. O, uşaq olarkən ailəsi Ağdamın Abdal Gülablı kəndinə köçüb. 1988-ci ildə başlanan Qarabağ münaqişəsi başqa həmvətənlərimiz kimi ilk gündən Fazili də narahat edib. 1990-cı ildə Ağdam rayon Daxili İşlər Şöbəsində yaradılmış polis batalyonuna yazılan Fazilin səsi ən qaynar döyüş meydanlarından eşidilməyə başlayıb. 1991-ci ildə Qaradağlı kəndində ağır yaralanmasına baxmayaraq azacıq sağalan kimi yenidən döyüşə yollanıb. Döyüşlərdə böyük qəhrəmanlıqlar göstərib. 1991-ci ilin avqust ayında erməni işğalçılarına məxsus «Niva» markalı avtomobili ələ keçirib polis idarəsinə təhvil verib. Bu sayaq igidlikləri çox olub. Fazilin qəhrəmanlığı haqqında əfsanələr hələ sağlığından yayılıb. 1991-ci il sentyabrın 23-dən 24-ə keçən gecə ermənilərin Abdal Gülablı kəndinə hücum xəbərini eşidən Fazil dostu Salehlə birlikdə döyüşə tələsib. Ancaq Ağdama gələn yolda ermənilərin qurduğu pusquya düşüblər və Fazil bu döyüşdə qəhrəmancasına həlak olub. İgid Vətən oğlu Ağdamın «Qarağacı» qəbiristanlığında dəfn olunub.

Azərbaycan Respublikası Prezidentinin 8 oktyabr 1992-ci il tarixli 264 saylı fərmanı ilə Mehdiyev Fazil Umud oğluna ölümündən sonra Azərbaycanın Milli Qəhrəmanı adı verilib.

21 avqust 2011-ci ildə şəhidin doğum günü ilə əlaqədar olaraq “Facebook“ sosial şəbəkəsində yaradılan “Laçın və laçınlılar“ qrupunun təşəbbüsü ilə şəhidin Nəsimi rayonunda yerləşən büstü önündə “Şəhidlər ölməz, Vətən bölünməz” adlı anım tədbiri keçirildi. Tədbirdə “Laçın və laçınlılar” qrupunun üzvlərindən başqa Abuzər Nadirovun rəhbərlik elə-

diyi “Laçın“ futbol klubunun, Azərbaycan Məcburi Qaçqın və Köçkün Gənclər Təşkilatının üzvləri, ziyalılar, hərbiçilər və şəhidin döyüş yoldaşları da iştirak edirdilər.



Torpaqlarımız uğrunda şəhid olmuş soydaşlarımızın ruhuna dualar oxunduqdan və bir dəqiqəlik sükutdan sonra tədbiri giriş sözü ilə açan Laçın rayon Təcili Tibbi Yardım Stansiyasının baş həkimi Orxan Cəbrayılov Fazil Mehdiyevin döyüş yolundan, göstərdiyi igidliklərdən danışaraq onun bu gün də gənclərə bir örnək və qəhrəmanlıq nümunəsi olduğunu qeyd etdi. Sonra söz milli qəhrəmanın anası Şövkət xanıma verildi. Göz yaşlarını saxlaya bilməyən ana bu gün onlarla bərabər olduqlarına görə bütün tədbir iştirakçılarına minnətdarlığını bildirdi: “Bu gün ürəyim dağa döndü. Sizlərin hər biri mənim üçün övlad yerindəsiniz. Mən fəxr edirəm ki, gənc nəslimiz belə vətənpərvər böyüyür, keçmişinə, bu gününə hörmətlə yanaşır. Ailəm və yaxınlarım adından bir daha hər birinizə təşəkkür edirəm“.

Daha sonra çıxış edən Söhrab Həsənov, Abuzər Nadirov, Günel İsmixanova Fazil Mehdiyevin xatirəsini gənc nəslin daim ehtiramla xatırlayacağını söylədilər.

Sonda Elbrus Şahmarın qəhrəmana həsr olunmuş «Fazilin Allah dərgahına gedən ömür yolu» kitabı tədbir iştirakçılarına hədiyyə olundu.

**Siyavuş ƏMİRLİ**

## O KƏND BİZİM KƏNDİMİZDİ

### ZABUX KƏNDİ

Qonşu kəndlər (əhatəsi) – Sus kəndi, Fətəlipəyə kəndi (Həkərinin sol sahili), Cağazur kəndi (Zabux çayının sağ sahili), Ermənistan tərəfdən Gorus rayonunun Gorunzur kəndi və Dığ kəndi.

Zabux Həkəri çayı ilə Zabux çayının qovuşduğu yerdən (Çay qovuşan) bir qədər yuxarıda – iki çayın arasında, Zabux çayının sol sahilində yerləşirdi. Sonradan kənd böyümüş – çayın o tayında – Alxan dərəsində də evlər tikilmişdi. Laçın ərazisindəki ikinci böyük körpü bu kəndin ərazisində - Zabux çayının (Minkənd çayı da deyirdilər) üstündə idi. Kənd Laçının bir çox kəndləri kimi Ermənistanla sərhəddə yerləşirdi. Ermənistana gedən Beynəlxalq avtomobil yolu və yeraltı rabitə xətti bu kəndin ərazisindən keçirdi. Üç kənddən ibarət (Zabux, Sus, Qızılca) "Komsomol" kolxozunun sovetliyi və bütün inzibati binalar, orta məktəb, mədəniyyət evi, bəzi iaşə obyektləri bu kənddə yerləşirdi. Kənddə ta qədimdən su dəyirmanı olub. Heyvandarlıq təsərrüfatı olduğu üçün Zabuxda silos quyuları, böyük anbarlar, geniş ərazidə ot taya yerləri vardı. Kənddə yerli Zabuxlularla yanaşı qonşu Fətəlipəyədən, Fətəlipəyə Qışlağından (Bağırbəylilər ), Sus Xallanlısından və Sümüklüdən köçüb gəlmiş insanlar da məskunlaşmışdı.

***Yurd yerləri:*** Yal sümüklü, Çay sümüklü.

***Tirələr:*** Yerli Zabuxlu, Bağırbəyli, Xallanlı, Sümüklü.

***Məşğuliyyətləri:*** Zabux kəndində su altında xeyli bağlar varıydı. Zabux körpüsünün altından dəhnə vurub həm məhlələri, həm də bağları suvarırdılar. Bağlarda tut, alma, üzüm, heyva, gilas, gilənar, gavalı, ərik, göyəm yetişdirirdilər. Tutdan xanımlar bəhməz və irçal bişirərdilər. Kişilər isə tutu çəlləkdə qıcqırdıb araq çəkirdilər. Tut ağacları çox olduğu üçün dədə-babadan bu kənddə baramaçılıqla da məşğul olurdular. Bundan başqa tütün də əkilirdi. Hər üç kəndin (Zabux, Sus, Qızılca) ərazisində tütün emal etmək (qurutmaq üçün) tikililər varıydı. Kənddə hər kəsin bostan yeri vardı. Bostan ya həyətdə, ya da evdən aralı su tutan bir yerdə olurdu. Kələm, xiyar, pomidor, kartof, boranı, göyərti əkirdilər. Zabuxda həyətlərdə gözəl qızılgüllər becərirdilər. Mal, qoyun, keçi saxlayardılar. Kənd çay sahilində olduğundan həyətlərdə çoxlu ördək, qaz saxlayırdılar. Zabuxun əkin yerlərində bol buğda, arpa əkilirdi. Zabuxlular da çay balığı ovçuluğuna yaxşı bələd idilər. Zabuxda yaxşı divar ustaları və iri daşlardan başdaşı yonmaq peşəsinə yiyələnmiş ustalar varıydı.

***Yer adları:*** Bağlar – Qısxanımın bağı, Göyüşün bağı, Calaxlıq, Məmərzə yeri, Kəlbalı bağı, Allahqulunun dərəsi (altı bağ olub), Məmmədhüseynin bağı, Çınqıllı bağ, Düz bağ, Rəhimin bağı.

***Bulaqlar*** – Qızlar bulağı, Buzlu dərə, Zoğal bulağı, Çömçəli bulaq.

***Örüş adları*** – Topatılan, Qunça uçan, Zallar, Qasımoğlu kahası, Küllü kaha, Dəvə yurdu, Bədəl uçan, Kölgəli göl (Həkəri çayında), Qıjılı şam, Qızıl qəyə, Donuz qaçan, Qara qəyə, Çay qovuşan, Eylaz bağı, Ağ ev, Söyüdlü, Xırda bağın dərəsi, Kahalı, Susa yol dönən, Gen dərə, Ağca yazı (iki yerə bölünür: Böyük yazı, Xırda yazı), Quru dərə, Kömür basdırılan (Ermənistanla sərhəddə), Xırman düzü, Şavsen təpəsi, Mehdinin quzeyi, Daş qıran, Daşlı güney, Quzğun yuvası, Bədəlin yolarası, Xutun (Zahman) dibi, Umudun akasiyası, Otuz beş hektar, Sus çalası, Qurban təpəsi, Binin dərəsi, Sümüklü tələləri.

**İlham QƏHRƏMAN,**<br>
**Alıyev Umud Balış oğlu**<br>
**(Zabux kəndi)**

**<u>TƏBRİK</u>**

## YENİ DƏRS İLİNİZ MÜBARƏK!

Bütün dövrlərdə cəmiyyətin aparıcı qüvvəsi ziyalılar olub, ziyalı deyəndə isə ilk növbədə müəllimlər yada düşüb. Doğrudur, son zamanlar müəllimləri haqsızlıq qarşısında susan bir zümrə adlandıraraq biganəlikdə suçlayanlar da tapılır. Amma hərdən qınaq obyektinə çevrilsə də, aldığı maaşın azlığına görə ironiya ilə üzləşsə də əsl müəllimin cəmiyyətdəki xüsusi yeri danılmazdır.

Övladlarımızın təlim-tərbiyəsinə bizimlə birgə cavabdehlik daşıyan müqəddəs peşə sahiblərini 2011/2012-ci tədris ilinin başlanması münasibətilə səmimi qəlbdən təbrik edir, onların hər birinə möhkəm cansağlığı, çətin, eyni zamanda şərəfli işlərində uğurlar diləyirik!

Qoy bəzi səlahiyyət sahiblərinə Allah-təala elə imkan versin ki, gözləri müəllimin öz zəruri ehtiyaclarını ödəməyə güclə çatan halal məvacibində qalmasın.

Yeni dərs ilində hər kəsin ayrı-ayrılıqda təbrik payı var. Fürsətdən istifadə edib təbrikimizi şagirdlərə, yüksək balla nüfuzlu ali məktəblərə qəbul olunan abituriyentlərə, tələbələrə və onların valideynlərinə də ünvanlayırıq. Yeni dərs iliniz mübarək olsun!

*Axtar babaları, axtar Hüseyn,*
*Bir gün də nəvələr axtarar səni.*
**Hüseyn ARİF**

## DAĞLARDA İZİ QALDI



Şəlvə dərəsinin Vəlibəyli kəndində 1897-ci ildə anadan olmuş Talış Allahverdiyev kiçik yaşlarından Şəlvə dərəsində nüfuzlu seyid olan Məşədi Salah ağanın yanında uzun müddət dindən dərs almışdır. O, ərəb və fars dillərinə yiyələnərək o dövrdə Quranı mükəmməl şəkildə mütaliə edən 3-4 şəxsdən biri olmuşdur. Öz üzərində daim çalışdığını görən böyük qardaşı Allahverdiyev Əli Abış oğlu onu xalq qəhrəmanı Sultan bəyin yanına gətirir. Qardaşı Əli gənc Talışı Sultan bəyə təqdim edir və onunla birlikdə erməni daşnaklarına qarşı mübarizə aparmaq istəyini bildirir. Olduqca yaraşıqlı, cüssəli, tədbirli Talışla bir az söhbət edən Sultan bəy onu məmnuniyyətlə öz dəstəsinə qəbul edir və yaxın silahdaşlarından olan Talışın böyük qardaşı Əliyə işarə edərək deyir: “Bunun gələcəyi olacaq”. Həqiqətən də dünyagörmüş bəy yanılmadı. Bu gündən sonra bığ yeri yenicə tərləmiş Talış Allahverdiyev dəstənin ön sıralarında addımlamağa və mübarizə əzmi ilə seçilməyə başlamışdır.

Gündən-günə püxtələşən Talış Allahverdiyev fəaliyyətinin son 30 ildən çoxunu Laçın rayonunun müxtəlif kəndlərində kənd sovetliklərinin rəhbəri vəzifəsində çalışmış, insanların kasıbçılıq və savadsızlığını aradan qaldırmaq üçün mütəmadi olaraq dövlətin səlahiyyətli nümayəndələrinin diqqətini bu zonaya çəkmək üçün əlindən gələni etmişdir. Məhz bu əziyyətlərin nəticəsi idi ki, Talışın adını çəkərkən Şamkənd, Təzəkənd, Piçənis, Ağcakənd, Şəlvə, Minkənd, Aybazarı, Qorçu, Qoşasu kəndlərinin ağsaqqalları öz kəndlərinin abadlaşmasında, quruculuq işlərinin güclənməsində, insanların savadlanmasında onun danılmaz rolundan söhbət açıb el üçün canından keçməyə hazır olan əvəzsiz bir insan olmasından ürək dolusu danışırdılar. Onun qorxmazlığını, mətinliyini, döyüşkənliyini sübut edən bir çox faktlar vardır ki, bunların əksəriyyətinə onun haqqında o dövrdə dərc edilmiş qəzetlərdə rast gəldim. Həmin qəzetlər müxtəlif dövrlərdə: 1958, 1967, 1981, 1982-ci illərdə nəşr olunan qəzetlər idi. Həmin məqalənin birində bu günə qədər mənim üçün aydın olmayan, lakin maraq doğuran bir məlumata da rast gəldim və aydınlaşdırdım. Bu məlu-

mat 1967-ci ildə Laçın qəzetində T.Nəcibin qələmə aldığı "Talışvurulan" adlı məqalədə idi. Bu məqalədəki məlumatların daha geniş formasına Laçın qəzetində Tofiq Əhmədovun imzası ilə çap olunan "Biz sizdən öyrdəndik qəhrəmanlığı" adlı məqaləsində rast gəldim. Bu məqalənin bir fərqi vardı, peşəkar jurnalist hadisəni ağsaqqalın öz dilindən eşitdiyi kimi qələmə almışdı. Məqalə belə başlayırdı: "Xəyal Talışı bir qədər keçmişə apardı. Bəli, 1931-ci il 3 oktyabr. Həmin günü Talış Allahverdiyev xatırlayaraq dedi: Təzəkənddə sovet sədri işləyərkən yuxarıdan tapşırıq almışdım. Şəlvə dərəsində bandit dəstələri camaatı incidir, silah gücünə onların mal-qarasını talayıb aparırdılar. Odur ki, təcili mərd və mətin yoldaşlardan bir dəstə düzəldib, atlara minib Şəlvəyə yollandıq. Hacısamlının üst tərəfində - "Gen dərənin" yuxarısında bir dəstə banditlə rastlaşdıq və əlbəyaxa vuruşmalı olduq. Məni arxadan güllə ilə vurdular. Bir müddət müalicə aldıqdan sonra yenə də işə başladım. Həmin quldur dəstəsi qısa müddətdə dağıdıldı. Talış Allahverdiyevlə etdiyim bu səmimi söhbətdən sonra mənə aydın oldu ki, nəyə görə bu yerin adı Talışvurulan adlanır":

Laçından tərpəndim sökülən də dan,
Titrədim keçəndə İlan qayadan.
Kəsdi bənd-bərəmi Talışvurulan,
Heyrət muzeyidir dağlarım mənim.

Sonralar Daşlı, Vəlibəyli, Hətəmlər kəndlərində kolxoz sədri, ilk partiya təşkilatının katibi kimi vəzifələrdə işləyərkən Talış Allahverdiyev adamların işə səfərbər edilməsində, məhsuldarlığın artırılmasında, gənclərin vətənpərvərlik ruhunda tərbiyə edilməsində az əmək sərf etməmişdir. Bunun nəticəsidir ki, 1941-1945-ci illər Böyük Vətən Müharibəsində onun verdiyi tərbiyə öz bəhrəsini göstərmişdir. Qardaşı oğlu İsrafil Abışov, bacısı oğlanları Əhəd Hüseynov, Fərəc Cəfərov, Mədət və başqa gənclər Böyük Vətən Müharibəsində qəhrəmancasına döyüşmüş və itkin düşmüşlər. Qardaşı oğlu Abış Abışov isə Böyük Vətən Müharibəsində qəhrəmancasına döyüşmüş, orden və medallarla təltif olunaraq Vətənə alnıaçıq, üzüağ dönmüş və sonra daxili işlər orqanlarında çalışaraq polkovnik rütbəsinə qədər yüksəlmişdir. Digər qardaşı oğlu Şöhlət Abışov da böyük əzmlə Vətən müharibəsində iştirak etmiş, göstərdiyi igidliyə görə müxtəlif medallara layiq görülmüş və müharibə qurtardıqdan sonra geri dönmüşdür. Bacısı oğlu Səməd Hüseynov da Böyük Vətən Müharibəsinin iştirakçılarından olub sağ-salamat geri dönənlərdəndir.

Elə bu illərdə Talış Allahverdiyev rayonun 6 kənd sovetliyi üzrə tədarük müvəkkili təyin olunub. O, yeni vəzifəsində də hökumətin tapşırıqlarını müvəffəqiyyətlə yerinə yetirmişdir. Böyük Vətən Müharibəsinin ağır günlərində cəbhənin ehtiyaclarını ödəmək üçün əlindən gələni etmiş və "Əmək igidliyinə görə" medalı ilə təltif olunmuşdur. O dəfələrlə rayon və kənd sovetlərinin deputatı seçilmiş, o dövrdəki qurultaylarda fəal iştirak etmişdir. Ümummilli liderimiz, müstəqil Azərbaycan Respublikasının qurucusu, ulu öndərimiz Heydər Əliyevin sərəncamı ilə bir neçə orden və medala layiq görülmək də Talış Allahverdiyevə nəsib olmuşdur.

1977-ci ilin oktaybr ayından yerli əhəmiyyətli fərdi təqaüdçü olan Talış Allahverdiyev yenə də ictimai fəaliyyətini dayandırmamış, məktəblərdə keçirilən tədbirlərdə iştirak etmiş, gənclərdə Vətənə, əməyə məhəbbət hissi aşılamışdır.

Talış Allahverdiyev sayılan el ağsaqqalı olmaqla yanaşı, ideal ailə başçısı olmuşdur. 4 oğul 3 qız tərbiyə edib və son nəfəsində də oğlanlarına son sözü bu olub: "Sizə vəsiyyətim budur ki, ev ağsaqqalı yox, el ağsaqqalı olmağa çalışın". 1984-cü ildə 87 yaşında vəfat edən Talış Allahverdiyevin vəsiyyətini övladları, nəvələri və hətta nəticələri də bu gün həyata keçirməkdədirlər.

**Rəşad ABASLI,**
***"Laçın yurdu"nun xüsusi müxbiri,***
***Azərbaycan Universitetinin müəllimi***

**TƏBRİK**

## YAŞINDAN BÖYÜK GÖRÜNƏN QƏZET

Azərbaycanı bütöv görmək istəyənlərin qəzeti - "Bütöv Azərbaycan"ın 3 yaşı tamam oldu. Həftədə 1 dəfə 16 səhifə ilə çıxan qəzetin keçdiyi qısa yola nəzər salanda hiss edirsən ki, yaşından xeyli böyük görünür. Ailənin yükünü böyüklərlə bərabər çəkdiyinə görə vaxtından tez kişiləşən uşaqlara bənzəyir. Müqayisənin nə dərəcədə yerinə düşüb-düşmədiyinin fərqinə varmadan deyim ki, bütövləşməkdən özgə yolumuz yoxdur. Bu yolu yorulmadan qət eləmək isə uşaq işi deyil. Deməli, daha tez böyümək tarixi zərurətdir.

"Bütöv Azərbaycan" barmaqla sayılacaq qədər az olan o nəşrlərdəndir ki, heç bir müəllif imzasının bu qəzetin səhifələrində görünməsindən narahatlıq keçirmir. Çünki ağına-bozuna baxmadan "ədəbi məhsulları"nı harda gəldi çap etdirməyə can atan cızma-qaraçılardan fərqli olaraq, öz imzasına hörmətlə yanaşanlar hər qəzetə yazı göndərmirlər.

Hörmətli qələm dostlarım Tamxil Ziyəddinoğlu və İlham Məmmədli, tərifi xoşlamadığınızı, uzunçuluğu sevmədiyinizi yaxşı bildiyimdən əvvəlcədən rabitəsini, ardıcıllığını pozduğum cümlələri yekunlaşdırıram. Sizə kiçik kollektivinizlə birlikdə möhkəm cansağlığı, bu çətin, eyni zamanda şərəfli işinizdə uğurlar diləyirəm! Arzu edirəm ki, sonu sıfırla qurtaran rəqəmlə ifadə olunan yubileyinizdə "Bütövləşmiş Azərbaycan" adlı xüsusi buraxılışla Azərbaycanı bütöv görmək istəyənləri sevindirəsiniz!

**ƏDƏBİ İRSİMİZ**

## BÖYÜK BAYATI USTADI – SARI AŞIQ

Həm şifahi xalq ədəbiyyatı, həm də yazılı ədəbiyyatda mahir bayatı ustası kimi tanınan Sarı Aşığın həyat yolu hələ sağlığında ikən əfsanə və rəvayətlərə çevrilmiş, əsrlərin sınağından keçərək bu günümüzə qədər gəlib çıxmışdır.

XVII yüzilliyin təzkirəçisi H.Qaradağ əslən Qaradağ mahalındandır. Çox qədim vaxtlarda gəlib Qarabağın Zəngəzur mahalında, Həkəri çayının kənarında, Güləbird adlı qəryədə sükna edib… deyəndə aşığın həyatını daha qədimlərə aparır.

Arxeoloqlar 1927-ci ildə Sarı Aşığın qəbrini nəzərdən keçirmiş və günbəzin XVII yüzilliyin abidəsi olduğu qənaətinə gəlmişlər.

Güləbird kəndində Orucməmməd tayfası böyük bir nəsildi. O nəsil də Qaradağ mahalından gəlmədi (o vaxtlar insanlar istədikləri yerdə yaşayırdılar. Çünki ərazilər Azərbaycana məxsus idi). Orucməmməd kişi ilə Sarı Aşığın qohumluq əlaqələri olub, hər ikisi eyni vaxtda Güləbird kəndində yaşamağa başlayıblar. Güləbirddə böyük bir nəslin Orucməmməd kişinin adını daşıması heç də təsadüfi deyildi.

Sarı Aşıq isə haqq aşığı olduğu üçün yalnız zəmanəsindən, sevgisindən, bir də təbiətin gözəlliyindən bayatılar qoşub yazmışdır. Bu gün də Sarı Aşığın bayatıları dillər əzbəridir.

Hələ XVI yüzilliyin 1-ci yarısından başlayaraq Aşığın bayatıları təzkirəçilərin diqqətini cəlb etmiş, yeri gəldikcə tərtib etdikləri cünglərə köçürmüşlər. Azərbaycan Respubkikası Əlyazmalar İnstitutunun cünglər əsasında tərtib etdiyi (Asiya Məmmədova. "Bayatılar", 1977) kitab Sarı Aşığın bayatıları ilə açılır.

Məhəmməd İbn Məkkənin 1549-cu ildə köçürdüyü "Ləmə atüd Diməşqiyyə" cüngünə aşığın iki bayatısı daxil edilmişdir.

Mən Aşıq, yasəmən siz,
Bağların yasəmənsiz.

Mən öldüm gülə həsrət,
Gül sənsiz, yasəmənsiz.

XVII yüzilliyin cüngündən götürülmüş bayatılarda isə Aşıq Yaxşıya salam-dua da göndərir:

Aşıq, yaxşıya məndən,
Dürrün yaxşı Yəməndən.
Salam-dua təmənna,
Apar Yaxşıya məndən.

Sarı Aşığın məzarının bir neçə metrliyində hündür formada olan günbəz ucalır. Günbəz VII-IX yüzilliyin tarixi abidələrindəndir. Sarı Aşığın məzarı Güləbird kənd qəbiristanlığındadır. Sarı Aşıq bayatılarının birində Güləbird kəndinin lap yaxınlığındakı qədim Qaradağlı kəndinin adını çəkərək deyir:

Mən Aşıq Qaradağlı,
Qar tutmaz Qaradağlı.
Elim Məzməzək eli,
Yurdumdu Qaradağlı.

Qaradağlı deyilən yer Sarı Aşığın məzarından 200 metr aralıda, yəni Güləbird kəndinin aşağı hissəsindədir. Güləbird kəndinin üstündə, yamacın döşündə Sarı Aşığın yaylaq yeri, təxminən 2500 metr aralıda sevgilisi Yaxşının məzarının yerləşdiyi Maqsudlu kəndi qalmaqdadır. Bədxah erməni və rus hərbi birləşmələri tərəfindən Güləbird kəndi işğal olunana qədər kənd camaatı o yerləri tarixi abidə kimi qoruyub saxlayırdı. Sarı Aşığın bugünkü nəslə zəngin bir ədəbi irsi qalmışdır.

Böyük folklorşünas alim Salman Mümtaz yazır:

"Azərbaycanda Aşığın bayatıları dahi şairimiz Füzulinin qəzəlləri qədər mərufdur. Gəncliyə Vaqifin, Zakirin təsirini duydum. Aşığın təsiri də az olmayacaqdır. Çünki Aşığın özündən sonra gələn bütün el şairlərinə, o cümlədən Vaqifə, Zakirə təsiri olmuşdur. Aşığın bayatılarında tarix və məişətimizin mühüm bir qismi gizlənmişdir."

Sarı Aşığın bayatılarında həyat sevgisi, Vətəni sevmək, gözəllik rəmzi, haqqın və ədalətin bərqərar olması çağırışları daha çox yer alır.

Dörd misralıq bayatıda dərin bir fikir ifadə etmək, mənasını tam aydın şəkildə söyləmək Sarı Aşığın yaradıcılığının əsas xüsusiyyətidir. Cinas bayatı yaratmaq sahəsində Sarı Aşıq ən böyük ustad kimi şöhrət tapmışdır.

Mən aşiqəm, gülə naz,
Bülbül eylər gülə naz.

Dünya yaman dünyadı,
Ağlayan çox, gülən az.

Aşığın dörd sətirlik bayatısı haqsızlığa qarşı mübarizə hissi yaradır. Aşıq el dərdindən ev tikdiyini, qəmindən hasar çəkdiyini belə ifadə edir.

Mən aşiqəm ha sarı,
Sınıq könlüm ha sarı.
Aşıq dərddən ev tikmiş,
Qəmdən çəkmiş hasarı.

Aşıq vətənpərvər şairdir. Onun şeirlərində bütövlükdə Vətən anlamı hiss olunur:

Dünya cənnət olsa da,
Yenə Vətən yaxşıdı.

Aşıq hər şeydən əvvəl gözəllərdən vəfa, sədaqət, etibar tələb edir. Şair deyir ki, yaxşı gözəl o kəsdir ki, o özü də gözəlliyinin qədrini bilə, yerində danışıb, yerində gülə. Sarı Aşıq bütün ömrü boyu sevgilisi Yaxşının eşqinə sadiq qalmış, bayatılarla ona böyük bir "Yaxşınamə" yaratmışdır:

Aşıq, yaxşıdan gözlər,
Mürgün yaxşı dan gözlər,
Baxdıqca şirin düşər,
Doymaz Yaxşıdan gözlər.

Aşıq yaxşıdı, yaxşı,
Xalın yaxşıdı, yaxşı.
Sərraf baxdı bəyəndi,
Dedi yaxşıdı Yaxşı.

Dünya ədəbiyyatında gül və bülbül haqqında minlərlə əsərlər yazılmışdır. Lakin Aşığın bayatılarındakı cinas bənzətmə adamı heyrətə gətirir. Qızılgül təzə açılarkən onun rəngində qaraya bənzər qızartı olur, həmin qızartı xeyli qalıb öz rəngini dəyişir. Aşıq onu bülbülün bağrındakı qana bənzədərək deyir:

Mən aşiqəm qanlı gül,
Qanlı seviş, qanlı gül.
Yemiş bülbül bağrını,
Çıxmış ağzı qanlı gül.

Aşığın yaradıcılığında məhəbbət kamilliyi mənalı ömrün yaşadıcı qüvvəsinə çevrilir. Aşıq bütün uydurma dinlərdən yaxa qurtararaq "Məhəbbət dini" yaratmışdır. Şair məhəbbətin gücünü bütün dünyada olan

digər güclərdən üstün tutur. Düşünən başlara ağır zərbələr endirildiyi bir dövrdə, dövlət qılıncının xalqı doğradığı bir zamanda özünü azadlıq carçıları Həllac Mənsura, Nəsimiyə bənzətmək, fərdi məhəbbəti bəşəri məhəbbətə çevirib sevgilisini Məkkə, Mədinə adlandırmaq şairdən çox böyük cəsarət tələb edirdi:

Mən Aşıq, o yar mənim,
Qəm bağrım oyar mənim.
Məkkəmdi, Mədinəmdi,
Qibləmdi o yar mənim.

Qüdrətli qələm sahiblərimiz bayatı ustası Sarı Aşıq haqqında və onun yaradıcılığı ilə bağlı zaman-zaman dəyərli fikirlər söyləmişlər:

"Azərbaycan ədəbiyyatında cilalı, bitkin, bədii cəhətdən mükəmməl bayatı yaratmaq ənənəsi Sarı Aşığın adı ilə bağlıdır"

**S.Paşayev,**
*filologiya elmləri doktoru, professor*

"Həqiqət odur ki, Füzuli poeziyası ilə Sarı Aşıq şeiri iliyinə, qanına qədər bir-birinə yaxındır".

**A.Vəfalı,**
*şair*

"Füzuli sözünün damarlarında Dədə Qorqud qanı axdığı kimi, Sarı Aşığın da canında Füzuli qanı axmışdır"

**K.Vəliyev,**
*professor*

"Sarı Aşığın misralarındakı məhəbbət bəşəri məhəbbətdir. Bu məhəbbət reallıqla əfsanələşmişdir. Zaman keçdikcə o daha sürətlə dünyəviləşəcəkdir".

**S. Rüstəmov,**
*şair*

"Sarı Aşıq böyük bayatı ustadı, aşıq şeirinin bayraqdarıdır"

**M.H.Təhmasib,**
*professor*

Sarı Aşıq müdrik zəkaları heyrətdə qoyan el filosofudur. O, deyişmə meydanında idrak bayrağı qaldırmışdır.

Sarı Aşıq nəinki Azərbaycanın, bütövlükdə Türk dünyasının bayatı ustasıdır. Gələcək nəsillər Sarı Aşığı çox tədqiq edib öyrənəcəklər. Çünki o, keçmişimizlə bu günümüzü birləşdirən nəhəng bir körpü yaratmışdır. Bu körpünü qoruyub gələcək nəsillərə ötürmək isə bizim borcumuzdur.

**Ramiz QƏNİMƏTOĞLU**,
***"Sarı Aşıq" Xatirə Muzeyinin və "Sarı Aşıq" Araşdırmalar Mərkəzinin müdiri***

# QƏLƏM DOSTUMUZA YUBİLEY TƏBRİKİ



Mən Elnuru 10 ilə yaxındır ki, tanıyıram. Onunla ilk tanışlığım əməkdaşı olduğum “Təbib” qəzetinin redaksiyasında başlayıb. Qəzetimizin baş redaktoru Eldar İsmayıl Azərbaycan Tibb Universitetində təhsil alan bu gəncin yazılarına baxmağı tapşırmışdı. Biz qısa söhbətdən sonra bu qənaətə gəldik ki, o yalnız çap olunmaq xətrinə yazmır və üz tutduğu bu yolda qətiyyətlidir. Haqlı iradları təmkinlə qəbul etməsi, razılaşmadığı fikirlərə yerindəcə münasibət bildirməsi, bir az emosional danışıq tərzi diqqətimizdən yayınmadı. Necə deyərlər, söhbətimiz tutdu.

Zamanın sınağından keçən bu tanışlıq aramızda böyük yaş fərqinin olmasına baxmayaraq, dostluğa çevrildi. İndi hesab edirəm ki, uğurlarına sevindiyim qələm dostumun yaşı ilə müqayisədə çox zəngin görünən bioqrafiyasına nəzər salmaq yerinə düşər.

Elnur Sədi oğlu Mehdiyev 1981-ci il avqustun 14-də Bakı şəhərində həkim ailəsində doğulub. 1988-ci ildə Bakı şəhəri, Əzizbəyov rayonunun (indiki Xəzər rayonu) Buzovna qəsəbəsində yerləşən 26 saylı orta məktəbin I sinfinə gedib. 1998-ci ildə həmin məktəbi müvəffəqiyyətlə bitirib. 2000-ci ildə Azərbaycan Tibb Universitetinin pediatriya fakültəsinə daxil olub və həmin fakültəni 2006-cı ildə yüksək qiymətlərlə başa vurub. 2006-2007-ci illər ərzində isə Ə.F.Qarayev adına 2 saylı Klinik Uşaq Xəstəxanasında internatura keçib.

Universitetdə təhsil aldığı zaman bir sıra ictimai işlərə xüsusi diqqət ayırıb. Belə ki, 2004-2006-cı illər ərzində Azərbaycan Qızıl Aypara Cəmiyyətinin ATU Komitəsində pediatriya fakültəsi üzrə sədr işləyib.

2004-cü ilin oktyabrından Yeni Azərbaycan Partiyasının üzvüdür.

2001-ci ildən bu günə qədər Elnur həm də bədii yaradıcılıqla məşğuldur. 2006-cı ildən Azərbaycan Yazıçılar Birliyinin, 2007-ci ildən isə Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür.

2004-cü ildən dövri mətbuatda şeirləri və tibbi yazıları çap olunur. “Təbiətin öz məlhəmi” adlı ilk yazısı Azərbaycan Tibb Universitetinin mətbu orqanı olan “Təbib” qəzetində 10 aprel 2004-cü ildə işıq üzü görüb. Elə ilk şeiri də həmin qəzetdə çap olunub.

Elnurun poeziyaya həvəsi ötəri olmayıb. Təsadüfi deyildir ki, 2005-ci ildən indiyədək 6 şeirlər kitabını - “Səni sevdiyimə peşman deyiləm”, “Qəlbimin sözləri”, “Səni sevməyimdir günahım mənim”, “Doğmalar,

müdriklər", "Sənsiz bu dünyanı neyləyirəm mən", "Tanrının töhfəsi" - oxucuların ixtiyarına verib. Onlarla kitabın korrektoru və bədii redaktorudur.

Bundan başqa "Ekspress", "Xalq qəzeti", "Mövqe", "PressPost", "Mühakimə", "Kredo", "Sağlamlıq və Rifah", "Kaspi", "Zaman" qəzetlərində və "Xəzər xəbər", "Azərbaycan dünyası" və s. jurnallarda şeir və publisistik yazıları dərc olunub. Amma bu gün də uğurla əməkdaşlıq etdiyi "Təbib" qəzeti ona xüsusilə doğmadır.

İndi ona doğma olan ədəbi-bədii publisistik bir dərgi də var: "Laçın yurdu". Onun dərgimizdə məsul katib işləməsini məsləhət görəndə də ilk növbədə məsuliyyət hissinin yüksək olmasını əsas götürmüşdük. Seçimimizdə yanılmadığımıza da əminəm.

Zəhmətinin bəhrəsini görən Elnur İrəvanlı "Qızıl qələm", "Araz" ali ədəbi media mükafatları laureatıdır.

Adı professor Teymur Əhmədovun tərtib etdiyi 1056 səhifəlik "Azərbaycan yazıçıları XX-XXI yüzillikdə" ensiklopedik məlumat kitabına (Bakı, "Nurlar", 2011) daxil edilib.

Həkim ailəsində dünyaya göz açması Elnurun dünyagörüşünə, bir şəxsiyyət kimi formalaşmasına təsirsiz ötüşməyib. Atası Sədi Mehdiyev Bakı şəhəri Sabunçu rayonu Maştağa qəsəbəsində yerləşən 7 saylı Birləşmiş Şəhər Xəstəxanasının Poliklinika Şöbəsində 31 ildir ki, həkim-cərrah işləyir. Anası İradə Mehdiyeva isə Bakı şəhəri Sabunçu rayonu Bilgəh qəsəbəsində, Xəzər dənizi sahilində yerləşən "Bilgəh" Kardioloji Sanatoriyasında 29 ildir ki, həkim-kardioloq vəzifəsində çalışır. Bacısı da ixtisasca həkim-kardioloqdur.

Bir haşiyə də çıxaq ki, Elnur İrəvanlının "Səni sevməyimdir günahım mənim" adlı kitabına ön sözü anası yazıb. Bu, ədəbiyyat aləmində rast gəlinən, bəlkə də, nadir hadisələrdəndir. Təbii ki, səmimiyyətlə yazılmış ürək sözlərinə ana məhəbbəti də qatılıb.

Ömrünün təlatümlü cavanlıq illərini yaşayan Elnurun fəaliyyəti iki istiqamətlidir. Ədəbi yaradıcılığında xeyli nailiyyətlərə imza atan Elnur İrəvanlının tibbi yazıları da maraq doğurur. Gələcəkdə həkim kimi də karyerasını quracağına inanırıq. Çünki qarşısına qoyduğu məqsədə çatmaqda inadkarlığı onu yaxından tanıyanlara sirr deyil.

Qələm dostumuzu 30 yaşının tamam olması münasibətilə səmimi qəlbdən təbrik edir, ona yaradıcılığında və şəxsi həyatında müvəffəqiyyətlər arzulayırıq. 30 yaşda əldə etdiklərini göz önünə gətirdikcə, 40-50 yaşda nailiyyətlərinin nəzərəçarpacaq dərəcədə artacağına şübhə yeri qalmır.

30 yaşın mübarək, əziz dost!

Qoy qələmin kəsərdən, sözün dəyərdən düşməsin!

**Arif MƏMMƏDLİ**

## ZİYALILARIMIZ



### PROFESSOR ZÖHRAB QARAYEV

Zöhrab İslam oğlu Qarayev 25 mart 1945-ci ildə Minkənd kəndində anadan olub. 1951-1961-ci illərdə Minkənd kənd orta məktəbində oxuyub. 1961-1966-cı illərdə N.Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutunun (indiki ATU) stomatologiya fakültəsində təhsil alıb.

1966-ci ildən Laçın rayonunun Alxaslı kənd xəstəxanasında həkim-stomatoloq, 1967-1968-ci illərdə isə Minkənd kənd xəstəxanasının baş həkimi işləmişdir.

1969-cu ildə Ə.Əliyev adına Azərbaycan Dövlət Həkimləri Təkmilləşdirmə İnstitutunun (ADHTİ) stomatologiya kafedrasının aspirantı olub. 1974-cü ildə Krasnodar şəhərində Kuban Dövlət Tibb İnstitutunda tibb elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə etmişdir.

1985-ci ilə qədər Ə.Əliyev adına ADHTİ-də əvvəlcə aspirant, sonra isə baş metodist və stomatologiya kafedrasında assistent, 1980-1985-ci illərdə Həmkarlar Təşkilatının sədri vəzifəsində işləyib.

1985-ci ildə müsabiqə yolu ilə N.Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutunun ortopedik stomatologiya kafedrasına assistent, 1987-ci ildə isə dosent vəzifəsinə seçilmişdir.

1990-cı ildən 2000-ci ilədək ATU-nun stomatologiya fakültəsinin dekanı vəzifəsində çalışıb.

2000-ci ildə Moskva şəhərində Mərkəzi Elmi-Tədqiqat Stomatologiya İnstitutunda doktorluq dissertasiyası müdafiə edərək tibb elmləri doktoru alimlik dərəcəsi almışdır.

Z.Qarayev 150-dən artıq elmi işin, o cümlədən 1 monoqrafiya, 3 dərslik, 8 tədris-metodik vəsait və 5 səmərələşdirici təklifin müəllifidir. Elmi işləri təkcə ölkəmizdə deyil, müxtəlif xarici ölkələrdə də çap olunub. ABŞ, Almaniya, Avstriya, İsveç, Portuqaliya, Türkiyə, Rusiya, Ukrayna, İran, Sinqapur, Özbəkistan, Qazaxıstan, Gürcüstan və digər ölkələrdə keçirilən beynəlxalq konqres və simpoziumlarda iştirak və çıxışlar edib.

O, ATU-nun Elmi Şurasının, Dissertasiya Şurasının, Azərbaycan Stomatoloji Assosiasiyasının (ASA), Beynəlxalq Stomatoloqlar Akade-

miyasının (ADİ), Beynəlxalq Stomatoloji Tədqiqatlar Assosiasiyasının (İADR), Beynəlxalq Stomatoloji Assosiasiyasının (FDİ) və Avropa Regional Stomatologiya Təşkilatının (ERO) üzvüdür. "Səhiyyə əlaçısı" döş nişanı və Azərbaycan Respublikası Səhiyyə Nazirliyinin "Fəxri fərmanı" ilə təltif olunub.

Professor Zöhrab Qarayev 2004-2007-ci illərdə ATU-nun Stomatoloji Klinikasının direktoru işləyib. 2005-ci ildən isə ATU-nun ortopedik stomatologiya kafedrasının professoru vəzifəsində çalışır.

Azərbaycan Respublikası Prezidentinin 20 sentyabr 2010-cu il tarixli sərəncamı ilə Əməkdar həkim fəxri adına layiq görülmüşdür.

**TƏBRİK**

## "HƏR VƏTƏNDAŞ ÖZ MƏMLƏKƏTİNİN XİLASKARI OLMALIDIR"

Təbrik edirəm, Arif müəllim! Laçın torpağının unudulmaması, o torpaqda yaşayan vətənpərvər, mərd, Vətən yolunda öz canlarını qoymuş həmvətənlərimizin yeni nəslə bir nümunə kimi çatdırılmasında mühum rol oynayacağına əmin olduğumuz bu gözəl dərgini ərsəyə gətirdiyiniz üçün çox sağ olun.

Böyuk türk şairi Mehmet Akif deyib: Hər vətəndaş öz məmləkətinin xilaskarı olmalıdır:

Sahibsiz olan məmləkətin
Batması haqdır.
Sən sahib olursan bu Vətən
Batmayacaqdır.

Nə qədər ki, Laçın torpağına bu məmləkətin ziyalı, mərd oğulları sahib çıxır, Laçın heç vaxt unudulmayacaq, bizim qəlbimizə, beynimizə həkk olunmuş Laçın bizdən sonra gələn nəslin qəlbində də daim yaşayacaqdır.



Sizin böyük zəhmətlə ərsəyə gətirdiyiniz "Laçın yurdu" dərgisinin nəşri də bu yolda atılmış ən uğurlu addımlardan biridir. Bu yolda bütün Laçın gəncləri adından yaradıcı kollektivə öz minnətdarlığımı bildirir və uğurlar arzulayıram! Hamının adından danışmaq səlahiyyətimin olmadığını bilsəm də, heç kəsin bu istəyimə qarşı çıxmayacağına inanıram.

Qələminiz kəsərli olsun!

***Dərin hörmətlə:*** **Sadiq ABIŞOV**

**KİTAB RƏFİ**

## "SULTAN BƏY VƏ XOSROV BƏY QARDAŞLARI" KİTABI NƏŞR EDİLİB




"Zəngəzur" Cəmiyyətləri Birliyi xalq qəhrəmanı Sultan bəyin anadan olmasının 140 illiyi ilə bağlı elan etdiyi müsabiqəyə yekun vurub. Birliyin sədri Hacı Nərimanoğlunun verdiyi məlumata görə, təqdim olunmuş materiallar arasında tarix elmləri doktoru, professor Ziyadxan Nəbibəylinin "Bütöv Azərbaycan", "Təzadlar" və digər qəzetlərdə gedən silsilə məqalələri Sultan bəyin ömür yoluna həsr olunmuş ən uğurlu yazılar hesab edilərək, müəllifə elmi-tarixi əhatə dairəsini genişləndirməklə kitab şəklində hazırlamaq tövsiyə olunub.

Nəticədə 176 səhifəli "Sultan bəy və Xosrov bəy qardaşları" kitabı "Nurlar" Nəşriyyat-Poliqrafiya Mərkəzində işıq üzü görüb. Nəşrin redaktor və rəyçiləri "Zəngəzur" Cəmiyyətləri Birliyinin sədr müavini, "Bütöv Azərbaycan" qəzetinin təsisçisi və baş redaktoru Tamxil Ziyyədinoğlu və İdarə Heyətinin üzvü, "Bütöv Azərbaycan" qəzetinin redaktoru, filologiya üzrə fəlsəfə doktoru İlham Məmmədlidir. Kitaba istedadlı şair Zahir Abbas "Ön söz" yazmışdır.

Kitabda Azərbaycanın qədim torpaqlarından olan Zəngəzurda hər 3 nəfərdən birini xüsusi qəddarlıqla məhv edərək özünü "Zəngəzur qubernatoru" elan etmiş Andronikin qoşunlarına Sultan bəyin tutduğu divan, qardaşı - Azərbaycan Xalq Cümhüriyyətinin ilk Hərbi naziri, Gəncə və Qarabağın general-qubernatoru Xosrov bəyin erməni daşnaklarına qarşı mücadiləsi əsas yer tutur. Kitabda həmçinin Sultanov qardaşlarının təmsil olunduğu Qarabağ-Zəngəzurun və onun Laçın bölgəsinin etno-mənəvi dəyərlər tarixindən ətraflı bəhs edilir.

Kitabdakı 100-dən çox rəngli foto-şəkil qəhrəmanların yurd yerləri haqqında da zəngin təəssürat yaradır.

Tanınmış tarixçi alim, "Zəngəzur" Cəmiyyətləri Birliyi Ağsaqqallar Şurasının sədri, Azərbaycan Yazıçılar Birliyinin və Azərbaycan Jurnalistlər Birliyinin üzvü Ziyadxan Nəbibəylinin "Sultan bəy və Xosrov bəy qardaşları" kitabının işıq üzü görməsinə Laçın torpağının dəyərli ziyalılarından olan Tapdıq Abbasovun ailəsi maddi dəstək verib.

**MƏKTƏBLƏRİMİZ**

## MİNKƏND MƏKTƏBİ

Qafqaz Təhsil Dairəsi İdarəsinin 1890-cı il qərarı ilə Minkənd məktəbinin əsası qoyulmuşdur. Məktəb 42 nəfər şagirdlə rus-tatar (Azərbaycan) məktəbi adı altında açılmış, dərslər türk və rus dillərində tədris edilmişdir. Şəriət dərsi deyən ilk müəllimi Molla Vəli Kərbəlayı oğlu, digər dərsləri tədris edən Rəsul bəy Tahirov, rus dili müəllimi isə Geladze olmuşdur. 1896-cı ildə məktəbə Rəsul bəy Tahirov müdir təyin edilmişdir. 1912-ci ildə birsinifli məktəb ikisinifliyə çevrilmişdir. Bu təhsil ocağı 1920-ci ildən 7 illik natamam məktəb, 1940-cı ildən isə orta məktəb kimi fəaliyyət göstərmişdi.

Azərbaycanda belə məktəblərin yaranma tarixi o qədər qədim olmasa da, o zaman çar Rusiyası milli ucqarlarda təhsili inkişaf etdirməklə idarəetmə sistemini möhkəmləndirməyə çalışırdı. Məhz ona görə də XIX əsrin ortalarından başlayaraq milli ucqarlarda ibtidai təhsil verən, rus dilində yazıb-oxumağı bacaran kiçik məmurlar hazırlamaq məqsədilə bir sıra məktəblər açılmasına şərait yaradılmışdı. Sözsüz ki, həmin dövrün görkəmli ziyalıları bundan bəhrələnib yeni məktəblər açmışdılar. Minkənd birsinifli məktəbi də belə bir şəraitdə fəaliyyətə başlayaraq Zəngəzur qəzasında əhalinin maarifləndirilməsində müstəsna rol oynamışdı.

Minkənd məktəbi yarandığı vaxtdan etibarən rayonda təhsilin inkişafına töhfələr vermiş, əhali arasında savadsızlığın ləğv edilməsində ciddi rol oynamışdır. Vaxtilə Minkənd məktəbində təhsil alan Azərbaycan Xalq Cümhuriyyəti dövrünün dövlət xadimi, milli məktəblərdə rus dilinin tədrisi prinsiplərinin hazırlanmasında böyük xidmətləri olan Nurməmməd bəy Şahsuvarov respublikanın ictimai-siyasi, elmi-mədəni həyatında da fəal iştirak etmişdir. Mürsəl bəy Şahsuvarov AXC-nin göndərişi ilə Almaniyada təhsil alaraq bir müddət Hamburq Tropik Xəstəliklər İnstitutunda işləmiş, orada elmlər doktoru, professor olmuş, Azərbaycanda tibbi kadrların hazırlanmasında xüsusi xidmətlər göstərmişdir. Geologiya-mineralogiya elmləri doktoru, professor, uzun illər Bakı Dövlət Universitetinin geologiya fakültəsinin dekanı işləmiş Tofiq bəy Şahsuvarovun, tibb elmləri doktoru Rəhman Səfərəliyevin, Sumqayıt şəhər səhiyyəsinin qurucularından biri olan tibb elmləri namizədi, dosent İzzət Sadıxovun, İsmayıl Sadıxovun, Vəliyyədin Cahangirovun, Mirzəxan Əliyevin, Zakir Əliyevin, Şirin Məmmədquliyevin və onlarla başqalarının adları ölkəmizdə bu gün də yüksək ehtiramla çəkilir.

Minkənd orta məktəbini bitirən, xalqımıza ləyaqətlə xidmət edən profes-sor Mustafa Qarayev, Zöhrab Qarayev, fizika-riyaziyyat elmləri doktoru Maarif Cəfərov, iqtisad elmləri doktoru Qəmbər Əliyev, texnika elmləri doktoru Əli Yusifov, dosentlər Oruc Şahsuvarov, Zəfər Cəfərov, elmlər namizədləri Ələmdar Şahverdiyev, Fəxrəddin Əliyev, İmran Cümşüdov, Rövşən və Ağaverdi Həsənovlar, Nağı Nağıyev və başqaları da respub-likamızın tanınmış ziyalılarıdır. İlk təhsilini Minkənddə almış yüzlərlə ali təhsilli soydaşımız respublikamızın müxtəlif müəssisələrində uğurla çalışır, xalqımıza və dövlətimizə ləyaqətlə xidmət edirlər.



Yüksək dağlıq ərazidə yerləşən Laçın rayonu coğrafi baxımdan Ermənistanla sərhəddə Azərbaycanın qala qapısı idi. Kiçik Qafqaz dağ-larının ən hündür zirvələrindən biri olan İşıqlı dağının ətəyində yerləşən Minkənd təbiətinin gözəlliyi, neçə-neçə dərdin dərmanı olan mineral bulaqları və zəngin bitki örtüyü ilə də məşhur idi. Hər il Ağdam, Ağca-bədi, Xocavənd, Füzuli, Cəbrayıl, Beyləqan, İmişli və digər rayonların heyvandarları yay mövsümünü bu kəndin ərazisindəki geniş yaylaqlarda keçirirdi. Respublikanın müxtəlif bölgələrindən buraya istirahətə gələn-lərin də sayı çox idi.

Dağlıq Qarabağ münaqişəsi başlandığı 1988-ci ildən 1992-ci ilə kimi müharibənin birinci dövründə Minkənd orta məktəbinin onlarca igid

yetirməsi doğma yurdları uğrunda düşmənə qarşı qəhrəmanlıqla döyüşmüş, dəfələrlə yağıları geri oturtmuş, sinələrini düşmənə sipər edərək şəhid olmuşlar. Məktəbin məzunu Kamil Nəsibov Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. 18 nəfər şəhid verən, hazırda öz məzunu şəhid Bayram Məmmədovun adını daşıyan Minkənd məktəbinin pedaqoji kollektivi İlqar Şahverdiyevin rəhbərliyi ilə şagirdlərin keyfiyyətli təhsil almaları və onların dövlətimizin inkişafına layiqli töhfə vermələri üçün səylə çalışır.

**Namiq HÜSEYNOV**

**QARABAĞ QAZİLƏRİ**

## MƏZAHİR ABDULKƏRİMOV



Abdulkərimov Məzahir Bəhlul oğlu 1964-cü ildə Laçın rayonunun Ərikli kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra 1982-ci ildə Azərbaycan Politexnik İnstitutunun (indiki Azərbaycan Texniki Universiteti) mexanika fakültəsinə daxil olub.

1983-1985-ci illərdə ordu sıralarında hərbi xidmət keçən Məzahir 1989-cu ildə institutu bitirib və təyinatla Mingəçevir Yol Maşınlar Zavoduna göndərilib. Həmin zavodda mühəndis-konstruktor vəzifəsində çalışıb. 1992-ci ilin sentyabr ayında Mingəçevir Hərbi Komissarlığı tərəfindən milli orduya hərbi xidmətə çağırılıb. N saylı hərbi hissənin tərkibində olan taborda leytenant rütbəsində xidmətə başlayıb. Ağdərə, Sırxavənd, Dovşanlı, Mehmanə, Koçoqot, Vaqauz, Vəng, Umudlu, Aterk, Mağavuz, Sərsəng su hövzəsi, eləcə də Ağdam rayonu istiqamətində - Fərrux, Paprəvənd və s. bölgələrin azad edilməsi uğrunda gedən döyüşlərdə iştirak edib. 1994-cü ildə baş leytenant rütbəsi alan Məzahir Abdulkərimov 1994-1995-ci illərdə Pirəküşkül qəsəbəsində N saylı hərbi hissədə bölük komandiri kimi xidmət edib.

1995-ci ilin mart ayında Füzuli rayonu istiqamətindəki hərbi hissələrdə xidmət edən Məzahir 1996-cı ildə ordu sıralarından tərxis olunub.

Ailəlidir.

**KİMLƏR KEÇDİ BU DÜNYADAN**

## CÜMŞÜD ŞAHVERDİYEV



Cümşüd Saybalı oğlu Şahverdiyev 1929-cu ildə Laçın rayonunun İmanlar kəndində anadan olub. Atası Böyük Vətən Müharibəsindən qayıtmayan Cümşüd, qardaşı Cavanşir və bacıları Məntuqə, Əntiqə analarının - "Çiçəklər loğmanı Raziyə nənə"nin himayəsində böyüyüblər. Cümşüd Şahverdiyevin elmə, təhsilə xüsusi həvəs göstərməsində əmisi Şahverdi müəllimin şəxsi nümunəsi böyük rol oynayıb. O, 7 illik məktəbi qurtardıqdan sonra Laçın şəhərində 2 aylıq kurs keçərək Şəlvə kənd ibtidai məktəbinə müəllim təyin olunub. 1946-cı ildə Dambulaq kənd ibtidai məktəbində də dərs deyib. Müəllimlik fəaliyyətini dayandırmadan təhsilini davam etdirərək o vaxt Ağdamda təşkil olunan 2 illik institutu bitirib.

1954-cü ildə Hacıxanlı kənd 7 illik məktəbində kimya-biologiya ixtisası üzrə müəllim işləyib. 1955-ci ildə isə Şəlvə kənd 8 illk məktəbinin direktoru vəzifəsinə irəli çəkilib. 1976-cı ilədək həmin vəzifədə çalışan Cümşüd Şahverdiyevi, təşkilatçılıq qabiliyyətini nəzərə alaraq, 1976-cı ildə Hacıxanlı kənd orta məktəbinə direktor təyin ediblər. Adı çəkilən məktəblərin məzunları indi cəmiyyətdə layiqli yer tutan, üzərlərinə düşən vəzifəni ləyaqətlə yerinə yetirən nüfuzlu şəxslərdir. Düz 11 il Hacıxanlı kənd orta məktəbinə fasiləsiz rəhbərlik edən Cümşüd Şahverdiyev 1987-ci ildən İmanlar kənd orta məktəbində coğrafiya dərslərini tədris edib (2 illik institutda kimya-biologiya ixtisasına yiyələnən Cümşüd müəllim 1962-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) coğrafiya fakültəsini bitirmişdir). Bir qədər sonra məktəbin tərbiyə işləri üzrə direktor müavini vəzifəsində çalışan Cümşüd Şahverdiyev məlum hadisələrlə əlaqədar Sumqayıt şəhərində məskunlaşmış, 1992-ci ildən ömrünün sonunadək "Sarıqaya" düşərgəsində fəaliyyət göstərən Laçın rayon 21 №-li tam orta məktəbdə dərs demişdir.

2001-ci ildə vəfat edən Cümşüd müəllimin xatirəsi onu tanıyanların qəlbində daim yaşayır.

Cümşüd Şahverdiyevin fəaliyyəti yuxarıda sadaladıqlarımızla məhdudlaşmır. Onun xüsusi natiqlik qabiliyyəti vardı, mötəbər məslislərdə, rəsmi yığıncaqlarda məntiqli çıxışları ilə seçilərdi. Şəlvə dərəsində 3 gün,

3 gecə davam edən toyların "padşah"ı kimi də ad-san qazanmışdı. Təsadüfi deyil ki, başqa rayonlardan da tez-tez dəvətlər alardı. Toylarda "padşah"lıqla "tamada"lığın fərqi isə ayrı mövzudur.

Cümşüd müəllimin daha yaxın ətrafı onun bir istedadına da bələd idilər. Cavanlığında zarafatyana şeirlər yazardı. Qaçqınlıqdan sonra isə qələmə aldığı vətən həsrətli şeirləri, bayatıları yadigar qalıb. Həmin nümunələrdən bir neçəsini dərc edirik, ruhu şad olsun!

***

Cümşüdəm, dağılıb kəndim, şəhərim,
Gecə uzun, açılmayır səhərim.
Kövrəlibdi qəlbim, yoxdur təhərim,
Qartallı Laçınım yadıma düşdü.

***

İgidlər sirdaşı o köhlən atlar,
Piyada qalanın ürəyi partlar.
Harda gecələyir ellər, elatlar,
Pirani qocalar dururmu görən?

***

Dərmandı qarağat, moruq, baldırğan,
Asta yeri, dalamasın gicitkan.
Gözəlliklər məskənidir Nərdivan,
Qanadlanıb o yerləri gəz, könül.

***

Əziziyəm arxadı,
Dağlar dağa arxadı.
Atanın dar günündə
Oğul ona arxadı.

***

Baldan şirin baladı,
Əhvalımdan halıdı.
Hər övladın öz yeri,
Karlısı Niftalıdı.



*İmanlar kəndindən bir görünüş (foto Elxan Həsənovundur)*



*Laçın şəhəri, Abidənin yanı*

**O KƏND BİZİM KƏNDİMİZDİ**

## İMANLAR İMAN YERİDİ

İmanlar kəndi rayonun şimal hissəsində, rayon mərkəzindən 68 km məsafədə yerləşirdi. Şəlvə kənd ərazi-inzibati vahidliyinə daxildir. Dəniz səviyyəsindən 1800 m yüksəklikdə salınan kənd Şəlvə, Hacıxanlı, Dambulaq və Oğuldərə kəndləri ilə həmsərhəd idi.

Babalarımızın dediklərinə görə, kəndin adı bu əraziyə Gəncəbasardan köç etmiş İman kişi ilə bağlıdır, tarixi təxminən 1680-ci illərə təsadüf edir. Burada ilk dəfə məskunlaşan İman kişinin övladları da sonralar özlərinə ev-eşik düzəltmiş, ailə qurmuşlar. Evlərin, əhalinin sayı artdıqca eyni nəsildən olan insanların yaşadığı yerə ad qoymaq zərurəti yaranıb. Beləliklə, bu kəndi "İman kişinin nəslindən olanlar" mənasını verən İmanlar adlandırmışlar.

Rayonun ermənilər tərəfindən işğalına qədər kəndin 70 yaşayış evi, 300 nəfərdən artıq əhalisi olmuşdur. Kənddə orta məktəb, kitabxana, klub, tibb məntəqəsi və mağaza fəaliyyət göstərmişdir.

Həmişə ziyalıları ilə seçilən bu kəndin adamlarını düzlüklərinə, halallıqlarına görə çox vaxt "imamlar" deyə çağırardılar. El şairi Məhəmməd Səyyah kənd camaatının qonaqpərvərliyini belə poetikləşdirmişdi:

***İmanlar iman yeridi,***<br>
***Əsl mərd insan yeridi.***<br>
***İtləri zəncir tanımaz,***<br>
***Qalmağa mehman yeridi.***

O dövrün tələbinə uyğun olaraq peşə seçimində daha çox müəllimliyə üstünlük verən insanlar elmin, təhsilin əhəmiyyətini yaxşı anlayırdılar. Hələ XIX əsrin sonu, XX əsrin əvvəllərində mədrəsə təhsili almış Məşədi Səlim təkcə öz kəndində deyil, ətraf kəndlərdə də dini dərslər keçmişdir.

Məşədi Səlimin oğlu **Ənsar Mustafayevin dediklərindən:** - Məşədi Səlim Mustafa oğlu Novruzov İman kişinin nəticəsidir, 1863-cü ildə anadan olmuşdur. İman kişi əslən Gəncə şəhərindəndir. Ordan Ağdamın Zəngişalı kəndinə gəlib, Peykər adlı bir qadınla evlənib, sonra köçüblər indiki Budaqdərəsi kəndinin ərazisinə. Həmin yer əvvəl İmanın dərəsi adlanıb. Sonralar Hacıxanlı kəndinin ağsaqqalı Hacıxanın məsləhəti ilə indiki İmanlar kəndinin ərazisində məskunlaşan İman kişinin 5 oğlu olur: - Əsəd, Novruz, Məmmədhəsən, Məşədi Bayram, Həsən.

Novruzdan indiki Novruzlar, Əsəddən Şahverdilər, Məmmədhəsəndən Məmmədhəsənlər, Məşədi Bayramdan Bayramlar, Həsəndən isə Həsənlər nəsli törəyib. Məşədi Səlim kişi Mustafanın, Mustafa Novruzun, Novruz da İmanın oğludur. Novruzun 3 oğlu olur: - Cabbar, Nəsib, Mustafa. Bu 3 qardaşın hərəsinin 6 oğlu olur və nəsil böyüyür. Mustafanın oğlanları Kərim, Həmid, Müseyib, Həşim, Rəcəb və Məşədi Səlimdir. Bu 6 qardaşın yalnız biri, - Səlim ilahiyyət elmini öyrənmişdir.

Səlim kişi Laçının Alxaslı kəndindən olan dostu Molla Şükürlə ziyarətə gedir. Səlim kişi İrana - Məşədə, Molla Şükür isə Həcc ziyarətinə yola düşür. Səlim kişi ziyarətdən sonra Xorasan və Qum şəhərlərində ilahiyyət elmindən 3 il təhsil alır və ruhani molla kimi kəndə dönür.

1920-ci ildə Səlim kişini dostu, Şuşa məscidinin axundu Hacı Molla Şükür yanına çağırıb deyir ki, get Şəlvə kəndindəki məsciddə dərs ver. Səlim kişi 1920-ci ildən 1930-cu ilə qədər orda dərs vermişdir. Onun tələbələri sonralar Şəlvə dərəsinin sayılıb-seçilən elmli insanları olmuşlar: - İmanlardan Sahverdi müəllim, Zülü müəllim, Şəlvədən Fərəc, Həsən, Astan, Vəlibəylidən Dilən, Talış, Daşlıdan isə Ağəli, Kərimin oğlu Şahmar. Şahmar Hüseynov sonralar Laçın Rayon Partiya Komitəsinin birinci katibi işləyib.

Səlim kişi illərlə dövlətdən maaş ala bilməyib və şagirdlərin valideynləri ona haqq ödəmək istəyiblər. Bir dəfə onun şagirdi olan Vəlibəyli kənd sakini Talış məscidin qabağına bir qoç baglayır. Məşədi Səlim soruşur ki, bu nədir? Talış deyir ki, atam yollayıb, axı siz uzun müddətdir dövlətdən maaş ala bilmirsiniz. Məşədi Səlim, - bala, qoçunu geri qaytar, bu, dövlətlə mənim aramda olan məsələdir, - deyir. O, vəfat edən insanları dəfn edəndə pul almazdı. Xüsusən də "fəqir"i olandan. Deyərdi ki, fəqirin palazının üstünə çıxmaq olmaz, yoxsa səni yandırar. Heç vaxt dua yazmazdı, dua yazmağı haram və günah bir iş adlandırardı. Çox mədəni, əxlaqlı bir şəxs kimi tanınıb. O, tələbələri haqda da fikir söyləyərmiş: "Heydər zəkadı, Şahverdi nə tökürəm yığır".

Şahverdi müəllim Daşlı kəndində müəllim işləyərkən Səhliyal kişinin anası Ballı arvad deyib ki, - oturuşun, duruşun, yerişin, danışığın eyni Məşədi Səlimdir, təkcə görkəmin fərqlidir.

Məşədi Səlim 1943-cü ildə 80 yaşında vəfat etmişdir.

Təsadüfi deyil ki, ötən əsrin ortalarında da qonşu kəndlərin məktəblərində çalışan pedaqoji kadrların əksəriyyəti bu kənddən idi. El-obada böyük nüfuz qazanmış Şahverdi Şahverdiyev, Zülü Bayramov, Cümşüd Şahverdiyev, Bəhrəm Nəsibov və Bayram Bayramov bu gün də ehtiramla xatırlanır. Bir neçə nəslin formalaşmasında əvəzsiz xidmətləri olan Mə-

zahir Mustafayev, Əli Bəndəliyev, Əzim və Baloğlan Əzimovlar estafeti orta nəslə versələr də, ən azı mənəvi müəllimimiz olaraq qalırlar. Sabir Novruzov, Rafiq Niftəliyev, Sefi Rəsulov, Eldar Pirəliyev isə sevimli peşələrindən ayrılmayaraq indi də gənc nəslin təlim-tərbiyəsi ilə məşğuldurlar. Yaşlı nəslin ənənələrinə sadiq qalan orta və gənc nəsil də "Ziyalılar kəndi" adını qoruyub saxlamağı bacarıblar.

**Əlağa MUSTAFAYEV**

## <u>NƏSİL ŞƏCƏRƏSİ</u>

### MƏŞƏDİ SƏLİMİN NƏSİL ŞƏCƏRƏSİ




Məzahir
Sona
Çiçək
Yasəmən
Hacağa
Ülfət
Namiq
Tünzalə
Ənsar
Mirağa
Üzeyir
Kəmalə
Səltənət
Solmaz
Mehdi
Dürdanə
Səltənət
Uğurlu
Fəqan
Muxtar
Gilə
Əli
Vəli
Elmixan
Qorxmaz
Qalib
Hafizə
Qabil
Aqil
Tabıya
Gülsüm
Səlbi
Zülfəli
Lətif
Köçəri
Gülənbər
Kifayət
Sücaət
Hidayət

## "LAÇIN" FUTBOL KLUBU

Klub peşəkar fəaliyyətə 2007-ci ildə başlayaraq bir neçə turnir və yarışlara qatılıb. İlk dəfə AFFA-nın bayrağı altında FİFA və UEFA-nın tanıdığı ölkə birinciliyinin U-13 və U-14 liqalarında iştirak edib, indi də edir. 2009-2010, 2010-2011 mövsümündə komanda ilk ən güclü 10 komanda sırasına daxil olub. Bu il komandanın 6 üzvü ölkənin U-14 yığmasında rəsmən baxışa çağırılıb. "Laçın" komandası 2011-ci il BP şirkəti və tərəfdaşlarının maliyyə dəstəyi ilə keçirilən turnirin, eyni zamanda Bakı Şəhər Gənclər və İdman Baş İdarəsinin təşkilatçılığı ilə keçirilən turnirin qalibi olub. Komanda tanınmış ölkə klubları - hər bir şəraitə malik olan "Neftçi", "Bakı", "Azal", "OMİK" və digərlərinə qalib gələrək rayonumuzun adını futbol ictimaiyyəti arasında ucaltmışdır.



Artıq ölkə yığmalarında da klubumuzun üzvü oynayır, bu isə bütün Laçının uğurudur. "Laçın" FK haqqında Xəzər TV bir neçə dəfə veriliş hazırlayıb. Milli Olimpiya Komitəsinin təşkilatçılığı ilə keçirilən turnirin komandanın qalib olduğu final oyunundan süjetləri də Xəzər TV yayımlamışdır.

20 Yanvar şəhidi Azad Rzayevin xatirə turnirinin qalibi də (2011-ci il) "Laçın" komandası olub.

”Laçın“ FK Laçın rayonunu ölkə və xaricdə təmsil etmək hüququ olan tək komandadır. AFFA hər hesabatında UEFA və FİFA-ya “Laçın” futbol klubunun Laçın ərazisinin təmsilçisi olduğunu bildirir. Komandanın yaradıcısı və baş məşqçisi Abuzər Nadirovdur.

Abuzər Nadirov 1967-ci il fevral ayının 11-də Laçın rayonunun Mişni kəndində anadan olub. 1984-cü ildə Mişni kənd orta məktəbini bitirmişdir. Uşaq yaşlarından futbola böyük maraq göstərib. Ağdamın "Şəfəq" futbol komandasından təkliflər alsa da, ailə çətinliklərinə görə həmin komandada oynamaqdan imtina etmişdir.

1981-1987-ci illərdə Polşada hərbi xidmət zamanı da idmanın bu növü ilə məşğul olmuşdur. Həmin vaxt bir neçə klubun heyətində Polşanın 2-ci futbol liqasında oynamışdır. Futbol karyerası dövründə daha çox həvəskar klublarda çıxış etmişdir. Qarabağın ermənilər tərəfindən işğalından sonra Qaradağ rayonunda məskunlaşıb. Ümid qəsəbəsində yerləşən məcburi köçkün uşaqlarından təşkil olunmuş "Laçın" komandasında 1997-ci ildən baş məşqçi işləyir. Komandada əsas heyət 1995-1997-ci il təvəllüdlü uşaqlardan ibarətdir.

Ümid qəsəbəsində və digər qəsəbələrdə məskunlaşan köçkün uşaqları komandaya cəlb edilib və klubda 35-ə yaxın uşaq futbolun sirlərini öyrənir.

2010-cu ildə Bakı Şəhər Gənclər və İdman Baş İdarəsi tərəfindən ən yaxşı uşaq məşqçisi adına layiq görülən Abuzər Nadirovun yetişdirdiyi futbolçulardan biri Azərbaycanın uşaq yığma komandasında oynayır. 2010-cu ilin avqust ayında almanların məşqçilər üçün keçirdiyi kurslarda iştirak edən Abuzər Nadirov UEFA-nın “C kateqoriyalı məşqçi” adını qazanıbdır.

## ŞƏHİDLƏRİMİZ



### ƏBƏDİYYƏTƏ QOVUŞAN ÖMÜR

1968-ci ildə Laçın rayonunun gözəl guşələrindən biri olan Şəlvə kəndində dünyaya göz açan Şahverdiyev Ənvər Şahverdi oğlu 1992-ci ilin mart ayında Laçın rayon polis batalyonunun tərkibində silaha sarılıb torpaqlarımızın müdafiəsinə qalxdı. Ənvər ömrünün gənc çağlarında çox ağır döyüşlərdə qəhrəmanlıq göstərərək komandirlərin hörmətini qazandı. Vətən üçün canını belə əsirgəməyən Ənvər ölümün gözünə dik baxıb “Öncə

Vətəndir” - deyə dəfələrlə ağır döyüşlərə atıldı. Təəssüflər olsun ki, 1992-ci il 18 may tarixində Laçın rayonunun 120-dən çox kəndi ilə birlikdə Şəlvə də işğal edildi. 1992-ci ilin iyun ayında Laçın rayon polis batalyonu o vaxtkı Daxili İşlər naziri İsgəndər Həmidovun əmri ilə Kəlbəcər istiqamətindən Laçının bir neçə kəndini azad etmək üçün döyüşə başladı. O döyüşlərdə Laçın polis batalyonu Laçının bir çox kəndlərini düşməndən azad etdi.

1992-ci il iyulun 21-də Ənvərə komandanlıq tərəfindən kəşfiyyata getmək əmri verildi, bu, Ənvərin son döyüşü oldu. Yağı düşmən Ənvərin çiçəklənən ömrünü yarımçıq qoydu. Mən onun döyüşçü yoldaşı kimi deyə bilərəm ki, Ənvər kimi oğullarımız heç vaxt unudulmayacaq və biz belə oğullarımızla həmişə fəxr etməliyik. Ruhun şad olsun, döyüşçü qardaş!

**Saleh ŞİRİNOV**

**ZİYALILARIMIZ**

## CƏFAKEŞ HƏKİM



İsgəndərov Elçin Abbas oğlu 1942-ci ildə Laçın rayonunun Bozlu kəndində kolxozçu ailəsində anadan olub. 1949-cu ildə Bozlu kənd ibtidai məktəbinin I sinfinə gedib, 1959-ci ildə Qarqışlaq kənd orta məktəbinin X sinfini bitirib. 1960-cı ildən 1962-ci ilə kimi Bakı şəhərində “SU-49” tikinti idarəsində fəhlə işləyib. 1962-1965-ci illərdə hərbi xidmət keçib, zabit kimi tərxis olunub. 1965-ci ildə ADTİ-nin (indiki ATU) müalicə-profilaktika fakültəsinə daxil olub, 1971-ci ildə ADTİ-nin müalicə-profilaktika fakültəsini fərqlənmə diplomu ilə bitirib.

ADTİ-nin Elmi Şurası onun aspiranturada saxlanmasına qərar versə də, rayona qayıtmağı üstün tutmuş, 1971-ci ildən 1989-cu ilə kimi rayonun ən ucqar kəndlərindən olan Qarqışlaq kəndində baş həkim vəzifəsində işləmişdir. 1989-cu ildən Laçın RMX-nın baş həkimi vəzifəsində çalışır.

Rayon səhiyyəsinə rəhbərlik etdiyi müddətdə əhaliyə göstərilən tibbi xidməti yaxşılaşdırmaq üçün böyük əmək sərf etmişdir. 150 çarpayılıq xəstəxana-poliklinika kompleksinin tikintisinin reallaşdırılmasına, orta tibbi kadrlara olan tələbatı nəzərə alıb Bakı 2 saylı Baza Tibb Məktəbinin

Laçın filialının, RMX-da stomatoloji şöbənin açılmasına, Respublikanın Stomatoloji Mərkəzindən hərəkət edən stomatoloji maşının alınıb gətirilməsinə, "Sağlamlıq-2000" proqramına əsasən, 14 həkim ambulatoriyası, iki 25 çarpayılıq xəstəxananın tikilib istifadəyə verilməsinə nail olmuşdur.

Dağlıq Qarabağ hadisələri zamanı onun rəhbərliyi ilə 300 nəfərə yaxın ağır xəstə atəş altında Qubadlının Muradxanlı kəndindən vertolyot vasitəsi ilə evakuasiya edilib, respublikanın ixtisaslaşmış xəstəxanalarına çatdırılmışdır. Sərhəd kəndləri həkim briqadaları və təcili yardım maşınları ilə təmin edilmişdir.

İşğal ərəfəsində özünümüdafiə batalyonunun əsgərlərinə, polis şöbəsinin əməkdaşlarına, mülki əhaliyə tibbi xədmətin təşkilinə xüsusi diqqət ayırmışdır.

Laçın rayonu və onun ərazisi erməni hərbi birləşmələri tərəfindən işğal edildikdən sonra əhalinin 20 minə yaxını Ağcabədi rayonunun Laçın rayonuna məxsus qış yataqlarında, qalan hissəsi respublikanın 58 şəhər və rayonunda müvəqqəti məskunlaşmışdır. Rayon səhiyyəsinin heç bir maddi, texniki bazası olmayan bir dövrdə işğal edilməyən Güləbird kəndi istiqamətində, Ağcabədi qış yataqları ərazisində və digər rayonlarda əhaliyə tibbi xidmətin təşkilinə böyük ehtiyac duyulurdu.

E.İsgəndərov respublikanın səhiyyə, rabitə, ticarət nazirlərinin müavinləri F.Cavadov, N.Əhmədov, T.Tarverdiyev və Laçın rayon Rabitə şöbəsinin müdiri T.Bayramovla birlikdə Güləbird kəndi istiqamətində xidmət sahələrini təşkil etmək üçün Qubadlı rayonundan Güləbird kəndinə gedərkən, Ermənistanın Qafan rayonu tərəfdən qrad atəşinə tutulur, evlərdə yanğın və dağıntı ilə yanaşı, ölüm hadisələri ilə üzləşirlər. Bu çətinliklərə baxmayaraq Elçin həkim Güləbird kəndində qalan ailələrin və könüllülərdən ibarət batalyonun tibbi, rabitə və ərzaq ilə təminatına rəhbərlik edir.

Hal-hazıra kimi 58 rayon və şəhərdə müvəqqəti məskunlaşan rayon əhalisinin səhiyyə problemlərinin həllində yaxından iştirak etməklə bərabər, rayonun ictimai siyasi həyatında da fəallıq göstərir. Ümummilii Liderimiz Heydər Əliyevin və onun layiqli davamçısı İlham Əliyevin ideyalarına həmişə sadiqdir.

Azərbaycan Respublikasının Səhiyyə Nazirliyinin 85 illik yubleyində Səhiyyə Nazirliyinin fəxri fərmanı ilə təltif edilib. 2000-ci ilin noyabr ayının 2-də Respublika Prezidentinin Fərmanı ilə Əməkdar həkim fəxri adına layiq görülüb. QAC-ın yubiley medalı ilə təltif olunub. YAP-ın üzvüdür. Ailəlidir, 5 övlad atasıdır.

**Ülviyyə ZAMANLI**

MƏKTƏBLƏRİMİZ

## LAÇIN RAYON 5№Lİ TAM ORTA MƏKTƏB

Laçın rayon 5№li tam orta məktəbi Sumqayıt şəhərində 1992-ci ildən fəaliyyət göstərir. Şagirdlərin təlim-tərbiyəsi ilə 31 müəllim məşğul olur.

Fəaliyyətə başladığı gündən məktəbə Əlipolad Həbib oğlu Əzizov rəhbərlik edir.

Məktəbdə Laçın rayonunun müxtəlif kəndlərindən şagirdlər təhsil alırlar. Məktəb əvvəllər Sumqayıt Avtomobil Məktəbinin bazasında fəaliyyət göstərirdi. Burda isə çox çətinliklər var idi. Əsasən də qış fəslində çətinliklər üzə çıxırdı. Amma təhsilin keyfiyyəti azalmırdı və çalışırdıq ki, bu çətinlikləri aradan götürək. Belə də oldu, artıq bütün çətinliklər arxada qalıb. 2007-ci il sentyabrın 15-dən məktəb yeni inşa edilmiş binaya köçürüldü. Laçın rayon İcra Hakimiyyətinin sabiq başçısı Elburus Təhməzov dərs ilinin başlanması və yeni məktəb binasının istifadəyə verilməsi münasibəti ilə məktəb kollektivini təbrik etmiş və gələcək fəaliyyətlərində uğurlar arzulamışdı.



Məktəb şagirdləri rəsm, inşa, idman yarışları müsabiqələrində vaxtaşırı iştirak edir və nailiyyətlər əldə edirlər.

Məktəbdə dərslər son 3 ildə kurikulum sisteminə əsaslanaraq aparılır. Bu işdə ibtidai sinif müəllimləri Adilə Nəbiyeva, Xatirə Əsədova, Nəcibə Ömərova və Rafiq Həsənovun üzərinə böyük məsuliyyət düşür.

Pedaqoji kollektiv şagirdlərin təlim-tərbiyəsinə ciddi yanaşaraq onların layiqli vətəndaş kimi formalaşmasını həmişə diqqət mərkəzində saxlayır, əllərindən gələni əsirgəmirlər.

Artıq neçə illərdir ki, Təhsil Nazirliyi tərəfindən keçirilən mərkəzləşmiş imtahandan məktəbimizin şagirdləri uğurla çıxırlar. Əlbəttə ki, zəhmət olan yerdə qazanc da böyük olar. Bu günə kimi məktəbimizin şagirdləri buraxılış imtahanlarında yüksək nəticələr əldə etmişlər. Onu da qeyd edək ki, bu gün hər hansı bir məktəbin gücü onun yetirdiyi şagirdlərin ali məktəblərdə tutduğu yerlə ölçülür. Bu baxımdan da məktəbimiz həmişə seçilmişdir.

**Samirə BAYRAMOVA**

## KİMLƏR KEÇDİ BU DÜNYADAN

### QARACA RƏSULOV



Rəsulov Qaraca Nuralı oğlu 15 oktyabr 1932-ci ildə Laçın rayonunun İmanlar kəndində doğulmuşdur. Orta məktəbi başa vurduqdan sonra 1948-ci ildə Şuşa Kənd Təsərrüfatı Texnikumuna daxil olmuş və 1952-ci ildə texnikumu bitirmişdir.

1952-ci ildən Minkənd, 1956-cı ildən isə Şəlvə kənd baytarlıq sahəsinin müdiri vəzifəsində işləmişdir. İşlədiyi müddətdə qiyabi yolla ali təhsil almış, 1962-ci ildə Gəncə şəhərində S.Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna (indiki Azərbaycan Dövlət Aqrar Universiteti) daxil olmuş, 1968-ci ildə ali təhsilini tamamlamışdır.

1964-69-cu illərdə mərkəzi Daşlı kəndi olmaqla bir neçə kəndi özündə birləşdirən F.Engels adına kolxozun sədri, 1969-cu ildən Şəlvə kənd İcraiyyə Komitəsinin sədri vəzifəsində çalışmışdır. 1977-ci ildə yenidən Şəlvə baytarlıq sahəsinin müdiri vəzifəsində işləyən Qaraca Rəsulov ömrünün son illərini məcburi köçkün statusu ilə yaşamış, Laçın həsrəti ilə 2007-ci ildə dünyadan köçmüşdür.

El ağsaqqalı kimi tanınan Qaraca Rəsulov onu tanıyanların yaddaşında sözübütöv, həmişə gücsüzün tərəfində olan təəssübkeş bir insan kimi qalıb.

**AXTAR BABALARI…**

## BOLŞEVİK-ERMƏNİ TERRORUNUN QURBANI OLAN TÜRK KİŞİSİ



Xəlilov Səfəralı Abdulkərim oğlu təxminən 1890-cı ildə Zəngəzur qəzasının (Laçın rayonunun) Xaçınyalı kəndində anadan olmuşdur.

Uşaqlıq illəri o qədər xoş keçməsə də, yetkinlik yaşlarında öz bəlağəti və istedadı sayəsində mükəmməl olmasa da, dövrünün tələbinə uyğun biliyə yiyələnmişdir.

Gəncliyi isə, ümumiyyətlə, Qafqazın və Azərbaycanın təlatümlü, eyni zamanda əhəmiyyətli dövrünə təsadüf etdiyindən öz mütərəqqi düşüncə tərzi və baxışlarına görə bu prosesdən kənarda qalmamışdır. Belə ki, yaşadığı bölgədə böyük hörmətə və nüfuza malik olmaqla yanaşı, həm də yaşadığı zamana görə yaxşı vara-dövlətə sahib olmuşdur. Olduqca xeyriyyəçi, humanist xarakteri onu camaat içində daha da hörmətli etmişdir. Zamananın ağır və yoxsulluq şəraitində həmişə ev tikənlərə, toy edənlərə, ehtiyacı olanlara köməklik göstərməkdən zövq almışdır.

1915-1918-ci illərdə Zəngəzurda ermənilərin törətdiyi vəhşiliklərə və işğala qarşı aparılan döyüşlərdə əmisi Qara Əkbər və əmisi oğlanları, həm də qayınları Niftalı və Seyfalı ilə birlikdə, digər Piçənisli döyüşçülərlə Kırs dağında, Şuşa yaxınlığında Sultan bəyin dəstəsində qəhrəmanlıqlar göstərmişdir.

Müharibədən sonra Nuru Paşanın komandanlığı altında Qafqaz İslam Ordusu ilə gəlmiş Osmanlı əsgərlərindən iki nəfər yaralını aylarla evində saxlamış, sonra isə istəklərinə uyğun olaraq təmtəraqla Vətənlərinə yola salmışdır.

Sultan bəylə şəxsi dostluq əlaqələrinin olması və Temir yüzbaşı ilə ailəvi dostluğu sonralar onun Xosrov bəy Sultanovla da yaxşı münasibətlərinin qurulması ilə nəticələnmişdir.

Milli dövlətçilik məfkurəsinin daşıyıcısı olaraq bu hərəkatın və ideyanın müdafiəçisi olmağa çalışaraq, öz imkanları çərçivəsində bu proseslərdə çox səmimi iştirak etmişdir. Dəfələrlə Tiflisdə, Gəncədə Xosrov bəylə görüşmüş, burada "İttihad" partiyasının üzvləri ilə tanış olmuşdur. Bu tanışlıqlar sayəsində onun Nəsib bəy Yusifbəyli, Həmid bəy Şahtaxtinski, Nurməmməd bəy Şahsuvarov və digər "Müsavat" üzvləri ilə də isti münasibətləri yaranmış, özü də "Müsavat" partiyasının üzvü olmuşdur.

Yaşadığı bölgədə, kənddə maarifçiliyə, mədəniyyətə dəstək vermiş, o dövr üçün olduqca mütərəqqi bir sahə sayılan teatrlar təşkil etmişdir. “O olmasın, bu olsun”, “Arşın mal alan” tamaşalarını səhnələşdirib göstərmişdir.

Səfəralı Xəlilov oğluna yaxşı təhsil vermiş, mühasib ixtisasına yiyələndirmişdir. Təəssüf ki, 1920-ci illərdə “qırmızı terror”un başlaması ilə vəziyyət dəyişmişdir. Bütün Qafqazı, xüsusilə Azərbaycanı bolşevik talanı bürümüşdür. Milli dövlətimizin, onun fədailərinin başı üzərini qara buludlar almış, ölkə işğal olunmuşdur. Bu işğaldan Səfəralı və onun ailəsi də “nəsibini” almışdır: əmlakı talan edilmiş, evi, mal-qarası, atlarının müsadirə edilməsi hesabına kolxoz qurulmuş, özü və ailəsi isə “xalq düşməni” elan olunmuşdur. Dostları gedərkən ona da Türkiyəyə keçməyi məsləhət görsələr də, “mən arvad-uşağı soldatın ayaqaltısı edə bilmərəm” – deyərək etiraz etmişdir.

O, 1930-cu ildə həbs olunaraq Qazaxıstana, oradan da Sibirə sürgün edilmiş, 1937-ci ildə qayıdıb gəlmişdir. Bir neçə ay doğmalarının arasında yaşasa da, 1937-ci ilin noyabr ayında yenidən həbs edilərək Şuşaya aparılmış, elə oradaca güllələnmişdir. Başqa say-seçmə Vətən oğulları kimi, bu boylu-buxunlu, yaraşıqlı Türk kişisi də bolşevik-erməni terrorunun qurbanı olmuşdur.

**Əbülfəz**

**ŞƏHİDLƏRİMİZ**



## UNUDULMAZ QƏHRƏMAN

1969-cu ildə Laçın rayonunun Hacıxanlı kəndində doğulan Xəlilov Həbib Sevindik oğlu ömrünün gənclik illərini düşmənlə mübarizəyə sərf etməyə məcbur oldu. Laçın dağlarında gedən ağır döyüşlərdə iştirak edən Həbib üzvü olduğu Laçın polis batalyonunun şərəfini həmişə uca tuturdu. Dostları, həmkəndliləri Vüqar, Həmid, Ənvər, Xuduş, Saleh, Rəfayıl, Nəriman, Rəhim, Həmdəm, Məzahir, Əli, Eyvaz, Nazim, Rasim, Mikayıl, Yaşar, Müşfiq, Şiralı, Qəhrəman, Ələmdar, Yunus, Əlizaminlə birlikdə çox ağır döyüşlərdən keçdi. 1994-cü il aprel ayının 21-də Füzuli istiqamətində gedən ağır döyüşdə nankor düşmənlərimizin atdığı mərmi nəticəsində Rəfayıl, Nəriman və Mikayıl ağır yaralandılar. Həbib isə Vüqar və Həmidlə birlikdə şəhidlik zirvəsinə ucaldı. Allah rəhmət eləsin! Qoy bu igid oğullarımızın qəhrəmanlığı gələcək nəsillərə örnək olsun.

**Saleh ŞİRİNOV**

## QARABAĞ MÜHARİBƏSİ DÖYÜŞÇÜSÜ



İsgəndərov İlhami Əvəz oğlu 4 mart 1962-ci ildə Laçın rayonunun Ərikli kəndində doğulmuşdur. Ərikli kənd orta məktəbini 1979-cu ildə bitirmiş, 1980-1982-ci illərdə keçmiş Sovet Silahlı Qüvvələrində həqiqi hərbi xidmət keçmişdir.

1983-1988-ci illərdə M.F.Axundov adına Azərbaycan Pedaqoji Rus dili və Ədəbiyyatı İnstitutunda (indiki Slavyan Universiteti) təhsil almışdır. Təhsil aldığı dövrdə institutun bədən tərbiyəsi kafedrasında idmanın ağırlıq qaldırma növü ilə məşğul olmuşdur. Respublika daxilində ali məktəblər arası yarışın qalibi olduğu üçün 1988-ci ildə Belarusiya SSR-nin Vitebsk şəhərində SSRİ-nin ali məktəbləri arasında keçirilən ağırlıq qaldırma üzrə yarışda iştirak edərək qalib gəlmiş, SSRİ idman ustası adını qazanmışdır.

1988-ci ildə ali təhsilini başa vurduqdan sonra ixtisası üzrə Laçın rayonunun Şamkənd kənd orta məktəbinə müəllim təyin edilmişdir. Müəllim işlədiyi dövrdə partiya fəallığına və təşkilatçılığına görə S.M.Kirov adına sovxozun ilk partiya təşkilat katibi vəzifəsinə seçilmişdir.

1990-cı ilin faciəli 20 Yanvar hadisəsindən sonra Kommunist Partiyasına etiraz olaraq partiyadan imtina etmiş, 1990-1992-ci illərdə rayonun yerli mətbuat orqanı olan «Laçın» qəzeti redaksiyasında müxbir kimi fəaliyyət göstərmişdir. Öz məqalələrində Sovet Rusiyasının Azərbaycana qarşı yeritdiyi mənfur siyasətin mahiyyətini açıqlamaqla rayonda azadlıq hərəkatının iştrakçısına çevrilmişdir.

Laçın rayonunun işğalından sonra Laçın rayon Polis Şöbəsində yaradılmış Könüllü Polis Batalyonunun tərkibində erməni təcavüzünə qarşı başlayan əməliyyatlarda iştrak etmişdir. Laçın Könüllü Polis Batalyonunun döyüş fəaliyyəti 1993-cü ilin aprelindən sonra Füzuli rayonunda davam etdirildi. Füzuli rayonunun Balabəhmənli kəndindən başlayaraq sol tərəfi Araz çayı, sağ tərəfi Əhmədbəyli kəndi olan məsafə enində, Cəbrayıl rayonunun Cocuqmərcanlı kəndi də daxil olmaqla ərazilərin erməni işğalçılarından təmizlənməsi uğrunda fasiləsiz döyüşmüşdür. Atəşkəs elan olunana qədər cəbhənin ən qaynar nöqtələrində mövqe tutan İlhami İsgəndərovu heç vaxt şöhrət, ad düşündürməmiş, Vətənini mənfur erməni işğalçılarından azad etmək, dövlətimizin ərazi bütövlüyünü qorumaq üçün savaşmışdır. «Qəhrəmanlıq naminə qəhrəmanlıq göstərmək qəh-

rəmanlıq deyil» – ideyası altında vuruşmuş bir döyüşçü, sözün həqiqi mənasında əsl qəhrəman idi.

1994-cü il atəşkəsdən sonra Laçın Rayon Polis Şöbəsində işini davam etdirərək ölkənin ictimai asayişini qorumaq, siyasi sabitliyini saxlamaq üçün öhdəsinə düşən vəzifə borcunu layiqincə yerinə yetirmişdir. İti zəkası, çevik polis davranışı, real münasibəti rəhbərlik tərəfindən layiqincə qiymətləndirilmişdir. O, polis polkovnik-leytenantı rütbəsinə layiq görülmüş, Laçın Rayon Polis Şöbəsinin rəis müavini vəzifəsinədək yüksəlmişdir.

Qarabağ müharibəsində şücaəti, dəyanəti və çevikliyi nəticəsində düşmənlərin gülləsindən yayınan polis polkovnik-leytenantı İlhami İsgəndərov 3 dekabr 2004-cü il tarixdə bütün cəhdlərə baxmayaraq qaraciyər serrozu xəstəliyindən dünyasını dəyişmışdir. Üç övladı var.

**Ramil CƏBRAYIL**

## PUBLİSİSTİKA

### DOĞRUDANMI QARABAĞ DÖYÜŞSÜZ TƏSLİM OLUNUB?

***Və ya Çingiz Mustafayevin kadrları niyə tipik görüntülər deyil?***

90-cı illərin əvvəllərində Dağlıq Qarabağ və ətraf rayonlarda baş verənlər uzaq keçmişdə qalmasa da və o qədər də qaranlıq olmasa da, o zamankı hadisələrə münasibət birmənalı deyil. Bu baxımdan Azərbaycan cəmiyyətinin təfəkküründə iki portret cızılıb. Birincisi, Dağlıq Qarabağ və ətraf rayonlar qanlı döyüş əməliyyatlarından sonra işğal olunub, ikincisi, bu ərazilər döyüşsüz-filansız ermənilərə verilib.

Təəssüflə qeyd etməliyik ki, bu gün şəhər və kənd əhalisinin bir-birinə münasibəti baxımından bir qədər neqativ mənzərə hiss olunmaqdadır. Azərbaycan kəndlisi Azərbaycan şəhərlisini yumşaq desək, əxlaqi dəyərlərə qarşı gedən biri kimi qəbul edirsə, sıradan bir şəhərli belə təfəkküründə orta statistik Azərbaycan kəndlisini savadsız və dünyagörüşü yetərincə olmayan biri kimi canlandırır. Bu münasibət xüsusilə torpaqlarımızın işğalından sonra qaçqın və məcburi köçkün həmvətənlərimizin ölkənin digər şəhərlərinə üz tutmasından sonra qabarıq şəkildə özünü göstərməyə başladı. Şəhər camaatının kənd əhalisini həzm edə bilməməsi "torpaqlarınızı atıb qaçmısınız" kimi işlədilməsi ənənəyə dönən təhqiramiz ifadə ilə culğalaşmaqda – assosiativlik tapmaqda idi. "Təsir əks təsirə bərabərdir" aksiomu ilə gəlmələrin də yerlilərə neqativ münasibəti

yaranmalı idi və belə də oldu. Doğrudur, tədricən bu münasibət neytrallaşdı, ancaq "status-kvo"ya qayıtmaq mümkünsüz oldu. Təsadüfi deyil ki, qarabağlı ilə məsələn, bakılının bir-birinə münasibəti, bu, nə qədər normal olmasa da, bir çox dəyərlərə münasibət baxımından (və həmişə belə deyilsə də) qarşılıqlı "dodaqbüzmə" ilə müşayiət olunur. Hansı ki, azərbaycançılıq, eyni mentalitet bu baxışa da yer qoymamalı idi.

**Haşiyə:** Burada əslində bəlkə də qeyri-adi heç nə yoxdur – kənd və şəhər insanları həmişə bir-birindən fərqləniblər. Bu fərq az qala şəhərlə kəndin fiziki-coğrafi və yaşam tərzindəki qədərdir. Həmişə belə olub – meşə və dağ adamı səhra adamından həmişə fərqlənib. "Bəlkə bölücülük üçün yalnız bir doğru yol vardır: insanları meşə adamlarına və səhra adamlarına bölmək. Şərqin içkisiz sərxoşluğu səhradan gəlir. Səhrada isti külək və qızmar qum insanları sərxoş edir. Səhra dünyası sadə və problemsiz dünyadır. Meşə isə sularla doludur. Yalnız səhra su vermir, məhsul vermir və heç nə vəd etmir. Lakin ruhun atəşi, qığılcımı meşədən gəlir..." – deyə "Əli və Nino"da səhra adamı ilə meşə adamı müqayisə olunur. Bəli, həyat artıq bunu sübut edib – təəssübkeşlər səhradan gəlirlərsə, yaradıcılar meşədən və dağdan gələnlər olur. Qartallar dağlardan, pələnglər isə cəngəlliklərdən çıxır...

Qarabağın döyüşsüz təslim olunduğunu düşünənlər həm haqlı, həm də haqsız idilər. Xocalı hadisəsinin yaratdığı xof bir sıra hallarda Azərbaycana aid ərazilərin müqavimətsiz təslim olması ilə sonuclandı. Amma bu, bütünlükdə Qarabağın sakitcə tərki-silah olması demək deyildi. Amma bu cür rəyin formalaşmasında bir neçə faktor rol oynamışdı ki, biz onlardan demək olar ki, publika önündə heç vaxt qabardılmayan birinin üzərində dayanaq.

Söz yox ki, milli qəhrəman, reportyor Çingiz Mustafayev hər bir azərbaycanlı üçün qürur mənbəyidir. Onun xüsusilə Xocalı faciəsi ilə bağlı kadrları Azərbaycanın müasir tarixinin itməməsi baxımından olduqca dəyərlidir. Ancaq gəlin onun Laçında çəkdiyi kadrları və bu kadrlardan bütün Azərbaycana səslənən məlumat xarakterli fikirləri xatırlayaq. Təxminən belə: "Laçın uğrunda döyüşənlər indi burda gördüklərinizdir" (ətrafındakı 100-150 əsgərə işarə edir), "Burdan Qubadlıyacan getdim, bir dənə binamus, biqeyrət qayıtmadı", "Hamınız qorxaqsız, hamınız arvadsız", "Nə rəhbər, nə heç kim torpağı satmayıb, qorxub, tüpürüb qaçıblar".

Doğrudanmı, vəziyyət bu qədər eybəcər idi? Doğrudanmı, heç kim Qarabağda torpaq alveri etməmişdi, sadəcə, "qorxaqlar" o torpaqları atıb qaçmışdılar?! Doğrudanmı, alınmaz qalalarımız – Laçın və bundan 10 gün öncə Şuşa bu qədər asanlıqla düşmənə təhvil verilmişdi?

Laçında çəkilmiş kadrların birində Ç.Mustafayev kadra yaxınlaşaraq deyir: “Bu gün ayın 16-sı, saat 1-dir, Laçın boşaldılır, ancaq Laçına nə bir dənə güllə, nə də bir dənə qəlpə atılmayıb”.

Hansı ki, reportyorumuz bu məqamda yanılırdı. Hələ ayın 8, 9 və 10-dan etibarən, Şuşanın işğalından dərhal sonra Laçın ağır texnikaların fasiləsiz atəşinə məruz qalmışdı.

Digər bir tərəfdən, Laçın təkcə şəhərdən ibarət deyildi, onun 125 kəndi var idi və o kəndlərin əksəriyyəti sonuna qədər müqavimət göstərmişdi. Məsələn, Laçının sonuncu işğal olunan kəndi – Güləbird Laçının işğalından yalnız 1 il 3 ay sonra tutula bilmişdi.

Qarabağda gedən siyasi oyunlar, torpaq alqı-satqısı isə mübahisəsiz məsələdir və Ç.Mustafayevin söylədikləri ilə həqiqət arasındakı dərin uçurum ortadadır... Hər ilin mayında ANS-in bu kadrları təkrar-təkrar göstərməsinin nəyə hesablandığını isə anlamaq çətindir.

Bu yaxınlarda əlimə bir gündəlik keçdi. Könüllü döyüşçü Çingiz Məmmədovun Laçının Güləbird və ətraf kəndlərdə getmiş döyüşlər barədə qeydləri reallığı daha çox əks etdirir. Gündəliyi soyuqqanlı oxumaq sadəcə mümkün deyil.

**Həmin gündəlikdən:** - “Susuz dağ”a hücum başlanır. Bizi də bu istiqamətdə kömək üçün postdan geri çağırırlar. Həmin gün “Susuz dağ” istiqamətində şiddətli döyüş gedir, əməliyyat çox güclü alınır. Bizim atdığımız qrantamyot mərmiləri ermənilərin postunu, sığınacağını darmadağın edir. Ermənilər 9 nəfər itki verərək postu qoyub qaçmağa məcbur olurlar. Həmin gecə güclü yağış başlayır. Biz acından bir təhər olmuşuq. Səhər açılar-açılmaz meyitləri də götürüb Güləbirdə gəlirik. Meyitlərdən biri isə azərbaycanlı – Laçınlı İsa müəllim imiş. Sən demə, ermənilər onu Laçın işğal olunanda girov götürüblərmiş...

**Yenə həmin gündəlikdən:** - İki gün sonra isə Qızartı yüksəkliyinə hücum başlanır. Bir neçə saatın içində ermənilər postlarını qoyub qaçırlar... Bundan bir gün sonra isə Güləbird üçüncü şəhidini verir. Alış Malxələfdə ermənilərin qoyduğu minanın qurbanı olur.

Minatəmizləyən dəstənin komandanı sonralar bu hadisəni bu cür nəql edir:

- Alış o əraziləri yaxşı tanıdığından bizə çox kömək edirdi. O, mina ilə işləməyi də pis mənimsəməmişdi. Ancaq bu dəfə minanı çıxararkən onun sadəcə, bəxti gətirməmişdi. O, piyada mərmisini tapdı, həmin yeri qazdı, ancaq sən demə, piyada mərmisinin altında tank əleyhinə mina da varmış, üstdəkini qaldırarkən yəqin ki, tank minası işə düşüb və partlayış baş verib.

Həmin hadisələri Laçın rayon Polis İdarəsinin sabiq rəisi Akif Səlimov da yaxşı xatırlayır.

**Onun xatirələrindən:** - Ermənistanın Laçınla sərhədlərdəki görünən mövqelərində rus hərbiçiləri tank və BMP-lərlə dayanmışdılar. Ruslar psixoloji hücum effektli hərəkətlər nümayiş etdirsələr də, dinc əhaliyə atəş açmırdılar. Ancaq artileriyada olan ruslar Laçın şəhərini qarış-qarış vururdu. Mən, rəis müavini Telman Tanrıverdiyev və bir neçə döyüşçü mövqedən Kornidzor kəndi ərazisini binokolla müşahidə edərkən Laçına atəş açan topların alovlarını gördük və bizim topla oranı vurdurduq. Həmin vaxt ratsiyada bizim xəttə rusca təmiz danışan bir şəxs girdi. O dedi ki, mən Sibirdən olan rusam. Bu torpaqları boşaldacağıq. Mən təbii ki, ona kim olduğumu demədən izah etdim ki, Alik, sən russan, bu müharibə ermənilərlə bizimdir. Niyə bizə qarşı döyüşürsən? Alik belə cavab verdi ki, burda siyasət də var, pul da. Siz bizi dəvət edin gələk. Bu Laçının işğalından iki gün qabaq idi.



**Vüsal MƏMMƏDOV,**
***"168 saat" qəzetinin baş redaktoru***

**İDMANÇILARIMIZ**

## SAHİL XƏLİLOV



Xəlilov Sahil Bayram oğlu 1995-ci ildə anadan olub. İdmana böyük həvəs göstərən Sahil Rəşad Abbasovun rəhbərliyi altında məşqlərə başlayıb.

O, 2008-ci ildə Gürcüstanda keçirilən Qafqaz ölkələrinin çempionatında III yeri, 2011-ci ildə isə II yeri tutub.

2011-ci ildə Türkiyədə keçirilən Dünya çempionatında III yeri tutaraq bürünc mükafata sahib olub.

## POEZİYA



### Elman ELSEVƏR

Elman İsaq oğlu Mirzəyev 1948-ci il oktyabrın 3-də Laçın şəhərində ziyalı ailəsində anadan olub. İlk şeiri 1965-ci ilin noyabr ayında “Kənd həyatı”qəzetində çap olunub.

1966-cı ildə Laçın şəhər 1 saylı orta məktəbini bitirərək Azərbaycan Dövlət Universitetinin (indiki BDU) jurnalistika fakültəsinə daxil olub.

Tələbəlik illərində, eləcə də universiteti bitirdikdən sonra “Kommunist”, “Sovet kəndi”, “Bakı”, “Azərbaycan gəncləri”, ”Bakinskiy raboçi”, ”Vışka”, ”Molodyoj Azerbaydjana” qəzetlərində və “Kirpi”, “Kənd həyatı”, “Azərbaycan”, “Ulduz” jurnallarında işıq üzü görən bədii, publisistik yazıları həmişə bənzərsizliyi ilə diqqət çəkib. Oçerk və hekayələri dəfələrlə Azərbaycan Dövlət Radiosunda keçirilən müsabiqələrdə qalib gəlib.

1980-ci ildə SSRİ Jurnalistlər İttifaqına qəbul edilib və həmin ildən 1991-ci ilədək Azərbaycan Jurnalistlər İttifaqının Laçın rayon təşkilatının katibi olub. İki dəfə Azərbaycan Jurnalistlərinin qurultayında rəyasət heyətinə üzv seçilib.

Elman müəllim müxtəlif illərdə Azərbaycan Dövlət Teleradio şirkətində jurnalist, Laçın Rayon Bədən Tərbiyəsi və İdman Komitəsinin sədri, ”Şuşa” qəzetində kənd təsərrüfatı şöbəsinin müdiri, ”Laçın” qəzetində şöbə müdiri, məsul katib, redaktor müavini, Laçın rayon Audit şöbəsinin rəisi və digər işlərdə çalışıb.

### Meşədə tənha ağacam

Yollar açıb, atlar yordum,
dağlar yurdum, düzlər yurdum.
Tündə tünddüm, nura nurdum,
vurulub qollarım, yoxdu.

Bir üz qara, bir üz ağa
sığammayan uca dağam.
Od saçan diri bayrağam -
Soyulmuşam, dərim yoxdu.

Meşədə tənha ağacam,
Günəm, içimdən doğacam.
... Dolan buludam, yağacam,
boşalmağa yerim yoxdu.

Dünya dünya-dünyadımı,
yüz yerə böldü adımı.
Elə həmin dünyadımı -
dünyadan xəbərim yoxdu.

## Palıd

***Uşaqlıq dostum Malik Fərruxun xatirəsinə***

Yaşıl çətir idi
yol kənarında -
Məğrur. Tənha. Uca.
Başı qışdan qışa dəymişdi
palıd Palıd olunca.
Yolçular dincəlirdi kölgəsində...
Yox, onu aşırmadı qasırğa
bir payız gövdəsindən.
Kölgəsində ocaq çatıb
biş-düş edən biçinçilər
soluxan gördü yarpaqlarını
bir axşamüstü dönərkən biçindən.
Söyüd deyildi ki, arx kənarında,
dözmədi susuzluğuna vaxtın,
qurudu içindən!

***1999-cu il***

## Köçkün Ramiz

Bu şəhərin içində -
içində bir dənizin
səmt küləyi gözləyən yelkənli ağ gəmiyəm.
Bu dənizin içində-
içində ağ gəminin
marağı gözdən daşan
qərib səyyah kimiyəm.
Qalxıb-enir içindən dəniz mənim içimdə.
Enib qalxan,
qalxıb-enən dalğalara baxıram...
gah düşürəm dərəyə,
bax, təpəyə qalxıram yelkəni ağ gəmitək
mən dənizin içində.
Dalğalanır yelkənim...
Nə qəribə havadı,
göy üzündə xoşbəxt-xoşbəxt qaqqıldaşır qağayılar.
Səmt küləyi qalxan kimi
Sizi deyib,
üzəcəyəm, ulu dağlar!

***2003-cü il***

**Məmməd əmi**

Yazın ağzın boza verib,
yayı yolda toza verib,
Könlümü payıza verib
içiylə çıxıb gedirəm.

Atım vardı, yol tapmadım,
yol tapanda at tapmadım.
Bir qaşqa qəmər çapmadım,
cıdıra baxıb gedirəm.

Muradlarım düzdə qalır,
umudlarım sizdə qalır.
Gözüm o tay üzdə qalır,
gözümdən axıb gedirəm.

## Söz-söz pardaxlanan Səhər

***Fələklər yandı ahımdan, muradım şəmi yanmazmı?***
**Məhəmməd Füzuli**

Alovlanıb əridikcə
ahı, fəğanı içindən,
Alovlanıb, ərimədi
ahın, fəğanın içindən.

Gecə söz-söz ömür çatdı,
ömrə söz-söz ömür çatdı.
Dür sözü gücə çatmadı,
gücü elə sözə çatdı.

Ağrı-ağrı incə sözlər
inci-inci beyt toxudu -
Fikir-fikir dərinliklər
nurlanıb rəng-rəng oxudu...

İşıq kölgədən öncədi,
Kölgə işıq sönüncədi.
Pardaxlanır söz-söz Səhər,
Dan üzü bəyaz qönçədi.

***2002-ci il***

**İDMANÇILARIMIZ**

## XANƏLİ RƏSULOV



Rəsulov Xanəli Nofəl oğlu 1996-cı ildə Sumqayıtda, ailəsinin müvəqqəti məskunlaşdığı Sarıqayada anadan olub. 2002-ci ildə məskunlaşdığı ərazidə fəaliyyət göstərən Laçın rayon 21№li tam orta məktəbin I sinfinə gedib.

Kiçik yaşlarından idmana böyük maraq göstərən Xanəli "Nəqşi-Cahan" cüdo idman klubunda məşqlərə başlayır. Ona idmanın bu növünü sevdirən məşqçi Akif Qədimovun etimadını doğruldur və idmana marağının ötəri olmadığını uğurları ilə təsdiqləyir.

Sumqayıt şəhər Gənclər və İdman Baş İdarəsinin təşəbbüsü ilə 2009-cu ildə 1995-1996-cı il təvəllüdlü oğlanlar arasında keçirilən yarışda 42 kq çəki dərəcəsində III yeri tutur.

Sumqayıt şəhərinin 60 illik yubileyinə həsr olunmuş turnirdə də qələbə qazanır və xüsusi diplomla mükafatlandırılır.

İxtisaslaşdırılmış Olimpiya Ehtiyatları Uşaq-Gənclər idman məktəbinin cüdo üzrə 1996-1998-ci il təvəllüdlü oğlanlar arasında açıq birinciliyində isə ən yüksək pilləyə ucalaraq I yerin sahibi olur.

Bir-birinin ardınca qələbələrini təkrarlayan Xanəli 2010-cu ildə Xocalı, 2011-ci ildə isə 20 Yanvar şəhidlərinin xatirəsinə həsr olunmuş idman yarışlarında da diplomlara layiq görülür.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin təşəbbüsü ilə ümummilli lider Heydər Əliyevin anadan olmasının 88-ci ildönümünə həsr edilmiş açıq birincilikdə III yerlə kifayətlənən Xanəli "5 mart - bədən tərbiyəsi və idman günü"nə həsr olunmuş yarışda yenidən birinciliyini qoruyur.

Hələ yeniyetməlik dövrünü yaşayan, Mehdi Hüseynzadə adına Sumqayıt şəhər İxtisaslaşdırılmış Olimpiya Ehtiyatları Uşaq-Gənclər idman məktəbinin yetirməsi olan Xanəli Rəsulovu qarşıda daha böyük nailiyyətlər gözləyir. Arzumuz budur ki, o, Avropa və dünya çempionatlarında üçrəngli bayrağımızı daim yüksəklərə qaldırsın.

*Təqdim etdi*:
**Rəşid RƏSULOV**

# "LAÇINDA "SƏNÖLÜMÜZ", "MƏNÖLÜMÜZ", "ÇÖRƏK HAQQIMIZ" QALDI"

***Müsahibimiz Azərbaycan ikinci dəfə müstəqilliyinə qovuşduqdan sonra Laçın rayonunun ilk icra başçısı olmuş dəyərli ziyalımız, memar Azər Məmmədovdur.***

**- Azər müəllim, xoş gördük, necəsiniz? Havalar da yaman isti keçir, neyləyirsiniz?**

- Dözürük də, neyləyək ki, həyatdı, istisi də var, soyuğu da. Soyuğa da dözürük, istiyə də, köçkünlüyə də. Nə bilim, qismətimiz bu imiş, köksüz ağac kimiyik. Mən həmişə demişəm ki, laçınlılar kökünün üstündə deyil, çıxarılıb bir başqa yerdə əkilən ağaca bənzəyir. Biz kök ata bilmirik, ona görə də yaşlı nəslimizin çoxu gedib, Laçının itkisi həddindən çox olub. Bir dəfə biri dedi ki, "Laçın, Laçın" deyirsiz, nədi ey bu dağ camaatı... Bir epizodu xatırlatdım. İçərişəhərdə ofisim vardı. Metroyla gedib-gəlirdim. Bir dəfə metronun çıxışında dilənən qadın gördüm. Laçında şəhər sovetinin sədri işlədiyim vaxt bir-biriylə çəpər, yol davası eləyən iki qonşu qadından birinə oxşatdım. Özü də davakar olmayan, sakit, haqlı hesab etdiyim qadına. Sarsıldım, narahatlıq keçirdim. Geri qayıdıb o birisi keçiddən çıxdım. Baxdım ki, o deyil, elə bil çiynimdən ağır bir yük götürüldü, yüngülləşdim. Bax laçınlı budur, ən çətin anda da qürurunu saxlayır, özünü sındırmır, əyilmir.

**- Sizi Laçın ictimaiyyəti yaxşı tanıyır, ancaq istərdik ki, haqqınızda bioqrafik məlumatları öz dilinizdən eşidək.**

- 1954-cü ildə Hoçaz kəndində anadan olmuşam. Qardaşım 1959-cu ildən Sumqayıt şəhərində işləyirdi, qısa müddətdə orada mənzil almışdı. 1961-ci ildə kənddə cəmi 1 ay məktəbə getmişdim ki, qardaşım məni özü ilə Sumqayıta apardı, 1-ci mikrorayonda yeni açılmış 5 nömrəli məktəbdə təhsil almalı oldum. Bəlkə də memarlığa, incəsənətə marağıma Sumqayıtdakı dərnəklərin təsiri oldu. 7-ci sinifdə oxuyanda qardaşım xəstələnmişdi. O vaxtlar Sumqayıtda çox sayda kimya zavodları tam gücü ilə işləyirdi. Bu zavodların atmosferə buraxdığı zəhərli qazlar şəhərin havasını çox acınacaqlı hala salmışdı. 1967-ci ildə Sumqayıta qonaq gəlmiş atam bu vəziyyəti görüb məni də, qardaşımın ailəsini də Laçına qaytardı və mən 7-8-ci sinfi Hoçazda, 9-10-cu sinifləri isə Laçın şəhərindəki 1 №li orta məktəbdə oxudum. 1971-ci ildə orta məktəbi bitirib Politexnik İnstitutunun (indiki Texniki Universitet) memarlıq fakültəsinə daxil oldum. 1975-ci ildə Politexnik İnstitutunun inşaat profilli fakültələrinin ba-

zasında İnşaat Mühəndisləri İnstitutu (indiki Memarlıq və İnşaat Universiteti) yaradıldı və mən 1976-cı ildə İnşaat Mühəndisləri İnstitutunu bitirib Laçın rayon rəhbərliyinin rəsmi tələbnaməsi əsasında 1976-cı ilin oktyabr ayından Laçın rayonunun baş memarı kimi əmək fəaliyyətinə başladım.

1984-cü ildə Laçın Səhər Soveti İcraiyyə Komitəsinin sədri seçildim. 1989-cu ildə rəhmətlik Muradxan Cabbarov Zəngilan rayon Partiya Komitəsinin I katibi vəzifəsindən azad olunduqdan sonra Laçına qayıtdı və onun işlə təmin olunması zərurəti ortaya çıxdı. Bir neçə idarə rəhbərinə başqa işə keçib tutduğu vəzifəni Muradxan müəllimə vermək təklif olunsa da, heç biri daşıdığı vəzifədən könüllü şəkildə getmək istəmədi . Bu məsələni eşidib o dövrdə Laçın Rayon Partiya Komitəsinin birinci katibi vəzifəsində işləyən rəhmətlik Xanlar müəllimin yanına getdim və Muradxan müəllimin rayonumuzda, xüsusilə də Laçın şəhərində böyük zəhməti olduğunu, ağsaqqalığını nəzərə alıb könüllü olaraq daşıdığım vəzifəni ona vermək istədiyimi bildirdim. Mənim təklifim Xanlar müəllim üçün gözlənilməz oldu, dedi ki, sən cavansan, yaxşı mütəxəssissən, işindən də razıyıq, get öz işində çalış, biz Muradxan müəllimi münasib işlə təmin edəcəyik. Mən isə təkid edib Muradxan müəllimlə baş memar kimi daha çox iş görmək imkanım olacağını bildirdim. Xanlar müəllim, nəhayət, mənim təklifimlə razılaşdı. Bir neçə saatdan sonra məni kabinetinə çağırtdırdı. Muradxan müəllim də orada idi. O mənə bildirdi ki, Muradxan müəllim sənin könüllü olaraq Şəhər Sovetinin sədri vəzifəsini ona vermək istədiyinə inanmır. Mən Xanlar müəllimə dediklərimi yenidən təkrarladım. Lakin Laçınımızı respublikanın ən gözəl şəhərinə çevirmək arzumuzu həyata keçirmək məlum Qarabağ hadisələri ilə əlaqədar mümkün olmadı.

Sonra da Rayon İcraiyyə Komitəsi, Rayon Partiya Komtəsi ləğv olundu, yeni İcra Hakimiyyəti Aparatı yarandı, onda mən də oldum İcra Hakimiyyətində şöbə müdiri. 1990-91- ci illərdə İcra Hakimiyyətinin tikinti şöbəsinin müdiri olaraq şəhərin abadlığından çox, müdafiə obyektləri ilə əlaqədar işlərlə məşğul oldum. Təəssüflər olsun ki, Laçın torpağında şərəfli ölüm əvəzinə, 1992-ci ilin may ayında mənə Bakı şəhərində məcburi köçkünlük taleyi qismət oldu.

Laçınlıların bir xeyli hissəsi “Yeni Günəşli” massivində hələ su, kanalizasiya xətləri qoşulmayan, tikintisi başa çatdırılmamış binalarda yerləşmişdi. Mən də bu massivdə məskunlaşanlardan biri idim. Bir neçə laçınlı ilə Suraxanı Rayon İcra Hakimiyyəti başçısının qəbuluna getdik, vəziyyəti ona izah edib bildirdik ki, qanuni, qanunsuz, yığışmışıq bu binalara, siz onsuz da bu binalara su, kanalizasiya xətləri çəkməlisiniz. Göstəriş

verin tikinti təşkilatları binaların kanalizasiya, su xətlərini təcili düzəltsinlər, məskunlaşmış əhaliyə isə toxunmasınlar. Laçın işğaldan azad olunan kimi biz həmin mənzilləri sizə qaytaracağıq. (Çox təəssüf ki, o vaxtkı icra başçısı bizə verdiyi sözə əməl etdi, biz isə indiyədək verdiyimiz sözü yerinə yetirə bilməmişik. Nə Laçını işğaldan azad etmişik, nə də mənzilləri geri qaytarmışıq). İcra başçısının yanından çıxanda bizimlə olanlardan bir nəfər dedi ki, laçınlılar bu gün Milli Məclisin qarşısına toplaşırlar, gəlin biz də ora gedək.

Milli Məclisin qarşısına gəldik. Orada 400-500 adam toplaşmışdı. Milli Məclis rəhbərliyi ilə əlaqə yaradılmış və qərara alınmışdı ki, toplantı iştirakçılarından 7 nəfər nümayəndə seçilsin, həmin nümayəndələr toplantı iştirakçılarının tələb və istəklərini Milli Məclisin rəhbərliyinə çatdırsınlar. Biz oraya çatanda qəbula girəcək 6-cı nümayəndənin kimliyi müzakirə olunurdu. Maşından düşdüyümü görənlər mənim də nümayəndələrin tərkibinə salınmağımı təklif etdilər və mən də Milli Məclis rəhbərliyi ilə görüşmək üçün seçilmiş 6 nəfər nümayəndə ilə qəbul otağına getdim.

Bizi o vaxtlar millət vəkili, Prezidentin müşaviri Arif Hacıyev qəbul elədi. Müzakirənin əsas mövzusu hələ də müvəqqəti məskunlaşmaq üçün yer tapmayan, aralıqda qalan əhalinin məskunlaşmasına dövlət səviyyəsində kömək göstərmək, qanuni-qanunsuz məskunlaşmış əhalinin məskunlaşdığı binalardan Laçın rayonu işğaldan azad olunanadək çıxarılmaması barədə əlaqədar orqanlara rəsmi göstəriş vermək, Laçını işğaldan azad etmək idi.

Arif bəy toplantı iştirakçılarının bu tələblərinə anlayışla yanaşdı və bizdən xahiş etdi ki, bu gündən sonra qapıların sındırılaraq yeni mənzillərin özbaşına tutulmasına, xüsusilə də rusların mənzillərində məskunlaşmaya yol verilməsin. Bu faktlardan Rusiya bizim əleyhimizə istifadə edə bilər. O, məskunlaşmamış əhalinin boş yataqxanalarda, pansionatlarda yerləsdirilməsi və bu günədək məskunlaşmış əhalinin məskunlaşdığı mənzillərdən çıxarılmaması barədə əlaqədar dövlət qurumlarına göstəriş veriləcəyini dedi. Müzakirə olunacaq məsələlər bitdiyinə görə, ayağa qalxıb qəbul otağından çıxmaq istərkən Arif bəy bizə müraciət edərək soruşdu ki, kimin Laçına icra başçısı təyin olunmasını istərdiz? Sual hamı üçün gözlənilməz oldu. Hamı təəccüblə Arif bəyə baxdı.

**- Sizə verəcəyimiz növbəti sualın üstünə gəlirsiniz.**

- Bu, nağıllarda quş uçurtmaq məsələsinə bənzəyirdi (Gülür). Bizim üçün bu sual doğrudan da gözlənilməz idi. Sovet hakimiyyəti dönəmində rayon rəhbərliyi yuxarılar tərəfindən müəyyənləşdirilər, formal olaraq yerlərdə təsdiqlənərdi. Bizim Xanlar müəllimin işdən çıxarılacağı barədə

də məlumatımız yox idi. Bir neçə nəfər Xanlar müəllimin yaxşı adam olduğunu, elə onun öz vəzifəsində saxlanmasını məqsədə müvafiq saydılar. Arif bəy dedi ki, indi yeni siyasi hakimiyyət iqtidara gəlib. Köhnə icra başçısı mütləq dəyişilməlidir. Bir neçə laçınlının adı çəkildi və mənim adım da bu siyahıya düşdü. Laçınlı nümayəndələr mənim uzun müddət rəhbər dövlət orqanlarında işləməyimi, həm laçınlıların məni, həm də mənim laçınlıları yaxşı tanıdığımı bildirdilər. Arif bəy müzakirəni dayandırıb adları çəkilən namizədlər barədə düşünəcəklərini deyib bizimlə xudahafizləşdi.

İki gündən sonra məni Prezident Aparatına çağırdılar. Prezident aparatında məni Ərazi İdarəetmə şöbəsinin müdiri, dövlət müşaviri A.Hacıyev və dövlət katibi P.Hüseynov qəbul etdi. Söhbətimiz çox qısa oldu. Arif bəy dedi ki, biz Bakı şəhərində yaşayan nüfuzlu və tanınmış laçınlılarla məsləhətləşmələr apararaq qərara gəlmişik ki, sizi Laçın rayonuna icra başçısı təyin edək. İstərdik ki, sizin bizim bu təklifə münasibətinizi eşidək. Dedim ki, Laçın rayonu yoxdur, işğaldadır, olmayan rayona necə icra başçısı qoyursunuz? Bunu anlamıram, hərə dağılıb bir tərəfə.

Pənah bəy dedi ki, narahat olma, Laçının işğaldan azad olunması dövlətin vəzifəsidir və biz bu yaxınlarda Laçını da, Qarabağımızı da işğaldan azad edəcəyik. Sənin əsas vəzifən Laçın əhalisini öz yurd yuvalarına qaytarmaq və rayonun dağılmış infrastrukturunu qısa müddətdə bərpa etmək olacaqdır. Bu missiyanı yerinə yetirə biləcəksənmi?

Onlarda belə bir fikir yaranmışdı ki, Laçın camaatını ora qaytarmaq çətindir. Elə bilirdilər ki, biz bir ucqar yerdən qaçıb gəlmişik, burada qalmağa bəhanə axtarırıq. Onları inandırdım ki, belə problem olmayacaq. Dedim ki, Laçın işğaldan azad olunandan sonra əhalimizin 90-95 faizi öz yurd-yuvalarına qayıdacaq, buna heç bir şübhəniz olmasın. İnfrastrukturun bərpası isə mənim üçün çətin olmayacaq, bu məsələni sizin köməyinizlə inşaallah həll edərik. Əsas məsələ Laçının işğaldan azad olunmasıdır. Sonra Arif bəy dedi ki, biz sənin Laçının icra başçısı kimi təqdimat mərasimini Ağcabədidə keçirmək istəyirik, necə fikirləşirsən, oradakı əhali səni qəbul edəcəkmi? Bildirdim ki, laçınlılar mənə qarşı hörmətsizlik etməzlər, arxayın olun, heç bir problem olmayacaq.

Ertəsi gün Nazirlər Sovetinin sədr müavini Gülməmmədovla birlikdə vertalyotla Ağcabədi şəhərinə getdik. Ağcabədinin İcra Hakimiyyətinin akt zalında Laçının aktivləri toplaşmışdı. İcra başçısı rəhmətlik Xanlar müəllim, Rayon Sovetinin sədri Səlim müəllim və rayonun idarə, müəssisə rəhbərləri də orada idilər. Gülməmmədov tədbiri açıb Prezidentin fərmanını oxudu, mənə uğurlar diləyərək qarşıda duran vəzifələrdən

qısa danışdı. Sonra Xanlar müəllim söz alıb mənim təyinatımın hamının ürəyincə olduğunu və lazımı köməklik göstərəcəklərini bildirdi. Səlim müəllim, digər çıxış eləyənlər də barəmdə xoş sözlər söylədilər. Axırda söz alıb dedim ki, bir neçə namizədin içərisindən mənim icra başçısı tə-yin olunmağımin bir əsası var, o da doğma Laçınımızın işğaldan azad olunması yolunda uzatdığım əli bu gün hamının tutacağına əminlikdir, bu da günümüz üçün ən önəmli məsələdir.

Bakıdan gəlmiş qonaqları vertalyotla geriyə yola salıb rayonun Ağ-cabədidə yerləşən qərargahına gəldim. Qərargah üzvüləri ilə söhbət edib vəziyyətlə tanış oldum. Durum təsəvvür etdiyimdən dəfələrlə ağır idi.

Gecə Ağcabədənin mənə tanış olmayan istisində çarpayıya uzanıb səhərədək "nədən başlayım?" sualı ətrafında düşünməyə başladım.

Məndə olan məlumata əsasən, cənubdan Laçının Cicimli-Güləbird-Suarası istiqamətindəki, şimaldan isə Şamkənd zonasındakı kəndlərimiz hələ işğal olunmamışdı. Birinci növbədə bu kəndlərin müdafiəsini möh-kəmlətmək, ermənilərin hücumunun qarşısın almaq lazım idi. Bunun üçün isə respublikanın 60-dan çox rayonuna səpələnmiş əhalini axtarıb tapmaq, rayonun dağılmış infrastrukturunu bərpa etməkdən ötəri ayrı-ayrı rayonlara səpələnmiş idarə, müəsisə işçilərinin Ağcabədi rayonunun Taxtakörpü qəsəbəsində işə çıxması lazım idi.

Adətən iyun ayında arandan yaylağa köç eləməli olan mal-qara və qoyun-quzu sürüləri Ağcabədinin bu cırhacır istisində ortalıqda qalmışdı. Bu azmış kimi yaylaqda olan mal-qara və qoyun-quzu sürüləri də yaylaq-dan qışlağa tökülmüşdü. Mal-qara və qoyun-quzu arasında qızdırma baş-lamışdı. Hansı vasitə iləsə yaylaq yeri alanlar isə mal-qaranı, qoyun-qu-zunu daşımaq üçün maşın tapa bilmirdilər. Sürücülər idarə etdikləri ma-şınlarına ailəsini, yorğan-döşəyini yığıb hansısa rayona aparmışdılar. Hə-ləlik yerləri məlum deyildi.

Doğma torpaqlarımıza təcavüz edən mənfur ermənilərin qarşısını almaq üçün isə səfərbərlik elan edib əli silah tutanları orduya cağırmaq lazım idi. Hələlik ümidimizi könüllülərə bağlamışdıq.

Bunları fikirləşdikcə hansı yükün altına girdiyimi indi dərk edirdim. Bütün bu fikirlər altında dan yerinin ağardığını hiss etdim və yadıma bir lətifə düşdü: - Bir nəfər dəli olmuş inəyini bazara aparır. Başlayır inəyi tərifləməyə. Bir alıcı yaxınlaşıb inək yiyəsindən soruşur ki, qardaş, bu inəyin əgər dediyin kimi tərifldirsə niyə satırsan? İnəyin nöqsanını de, alım. İnək yiyəsi deyir ki, qardaş, əgər inəyi alsan bu gündən mənim çı-rağım sönəcək, sənin çırağın isə yanacaq. Alıcıya bu cavab xoş gəlir və inəyi alır. Gecə yatmaq istərkən görür ki, bu gün aldığı inək böyürür.

Lampanı götürüb tövləyə gələn kimi inək səsini kəsir. Kişi qayıdıb yatmaq istərkən inək yenə böyürür. Çırağı götürüb tövləyə qaçır. İnək kişini görən kimi səsini kəsir. Beləliklə, kişi səhərədək lampanı yandırıb inəyin yanında oturur. Səhər dan yeri ağaranda inək satan kişinin inəyin nöqsanı barədə dediyi sözlər yadına duşur. Və kişinin nə dediyini indi anlayır.

Dan yerinin ağardığını görüb mən də o vaxt anladım ki, rəhmətlik Xanlar müəllimin çırağını söndürüb, mənim çırağımı yandırıblar. Geriyə yol yox idi.

İlk növbədə Güləbirdə getdim. Güləbirdli Vaqif könüllüləri başına toplayıb Güləbird, Cicimli, Qazıdərə, Suarası, Fərəcan, Xanalılar, Səfian və Türklər kəndlərini müdafiə edərək bu kəndlərə ermənilərin girməyinə imkan verməmişdi. Güləbird körpüsü üzərindəki "Bayatı" pavilyonu bu kəndləri müdafiə edən hərbiçilərin qərargahına çevrilmişdi. Vaqif Laçında qalıb vuruşan hərbiçilərin real vəziyyətdə komandiri idi.

Mən Vaqiflə görüşüb ona yuxarıda sadaladığım kəndlərimizin ermənilər tərəfindən işğalına yol vermədiyinə, laçınlı könüllüləri başına toplayıb Laçın adına vuruşduğuna görə təşəkkür etdim. Güləbird istiqamətində vuruşan hərbi hissələrə hər cür köməklik göstərəcəyimi, onu bu hərbi qüvvələrə rəsmi komandir təyin etdirəcəyimi söylədim.

Bakıya qayıdan kimi Vaqifin ətrafına toplaşıb Laçında vuruşan hərbiçiləri Qubadlıda yerləşən hərbi briqadanın tərkib hıssəsi kimi rəsmiləşdirdim və Vaqifi bu hərbi hissəyə komandir təsdiq etdirdim.

Güləbirddən qayıdarkən yolüstü Qubadlıya döndüm. Qubadlıya yeni təyin olunmuş icra başçısı Baxış həkimlə görüşdüm. Güləbird istiqamətində Laçın kəndlərinin ermənilərdən müdafiəsi Qubadlı rayonunun təhlükəsizliyi üçün çox mühüm əhəmiyyət daşıyırdı. Ona görə də Baxış həkim mənim gəlişimdən cox sevindi və Laçın kəndlərini qoruyan hərbiçilərin Vaqifin rəhbərliyi ilə Qubadlıda yerləşən hərbi briqadanın tabeçiliyinə verilməsi onun da ürəyincə oldu. Cəbhə xətlərindəki vəziyyət barədə qarşılıqlı məlumat mübadiləsindən sonra Baxış həkim məndən soruşdu ki, bəs Xanlıq kənd məktəbində yerləşən laçınlı hərbiçiləri neyləyək? – Düzü, biz onları tərkisilah etmək üçün yollar axtarırıq, lakin bir az ehtiyat edirik. Kənd əhalisi onlardan çox narazılıq edir, təcili bu məsələni də həll etməliyik, - dedi. Mən, doğrusu, çaşıb qalmışdım, Xanlıq kəndində bizim hərbiçilərin olmasından xəbərsiz idim. Baxış həkimdən məsələnin nə yerdə olduğunu ətraflı öyrənib bu məsələni həll edəcəyimə söz verdim və təcili olaraq oradan Xanlıq kəndinə qayıtdım.

***(davamı növbəti sayımızda)***

**Arif MƏMMƏDLİ**

## TƏQDİMAT

### "DƏRDDƏN OLDUM HAQQ AŞIĞI"



Masamın üstündə istedadlı şair (didərgin şair) Kamil Vəfadarın zindan şeirləri mənimlə üz-üzə, göz-gözədir. Bəlkə on dəfə oxumuşam bu əzab və üzüntülərlə dolu yazıları. Onun son iki illik həbsxana həyatının dəmirə döyülmüş rəsmləridir bu ədəbi mətnlər (Bu ağrılı yazının mövzu başlığı da elə şeirlərin birinin içindən çıxıb oturub başda).

Bir şair kimi oxucular onun yaradıcılığına 1996-1997-ci illərdən müxtəlif mətbu orqanların: "Azərbaycan", "Ulduz", "Bayatı" jurnallarının, "525-ci qəzet", "Mühakimə", "Kredo" və "Məktəb" qəzetlərinin səhifələrindən bələddirlər. Kamil Vəfadar "Oxunmayan məktublar" və "Oğuldərənin igid oğlu" kitablarının müəllifidir.

Altı aylıq uzun sürən məhkəmə prosesindən sonra azadlıqdan məhrum edilən (ancaq günahsızlığı açıqca görünən) şairin yuxarıda qeyd olunan şeirləri onun humanistliyini və həqiqət aşiqi olduğunu bir daha təsdiqləyir.

Kamil Vəfadarın oxucuları inanacaqlar ki, Laçının Oğuldərə kəndindən Qarabağ savaşı zamanı didərgin düşüb, Bərdə şəhərində qərar tutmuş (2009-cu ildə həbs olunana qədər) bir şair – bir mübariz insan üçün həbsxana o qədər də qorxulu deyil! Qorxulu olan əqidədən və içindəki işıqlı ideallardan qeyri-məntiqi şəkildə əl çəkməyindir...

Hörmətli redaksiya, inanırıq ki, şair Kamil Vəfadarın bir neçə şeirini dərc etməklə onun mənəvi ağrılarına məlhəm qoyacaqsınız!

***Hörmətlə*: Rizvan NƏSİBOĞLU**

### Dolanır

Gövdə budağa arxadı,
Yarpaq budaqnan dolanır.
Bir kəlmə söz demək üçün
Dodaq dodaqnan dolanır.

Ovçunu əlik aparır,
Eləyirləlik aparır.
Qocanı çəlik aparır,
Uşaq adaqnan dolanır.

Dadmadığı acı yoxdu,
Şahdı, başda tacı yoxdu.
Ata, qardaş, bacı yoxdu,
Dustaq dustaqnan dolanır.

## Balalarıma

***"Dəmir qəfəs" silsiləsindən***

Ac qalsanız, gedin ümid
Qapısını döyün bir az.
Atasızlıq, əmisizlik
Dərdinizdən yeyin bir az.

Mən gələnə söz saxlayın,
Soyuq qışa köz saxlayın.
Qəddinizi düz saxlayın,
Qəminizi əyin bir az.

Hər şəkərim, balım sizin,
Qayğınıza qalım sizin.
Qadanızı alım sizin,
Hərdən gülün-deyin bir az.

Söyləyərlər ahı dağa,
Selə-suya axıtmağa...
Kişisiniz axı daha,
Olmayın ərköyün bir az.

Nə olsun ki, min ahı var,
Kamilin də Allahı var.
Bu işlərdə günahı var
Yerin bir az, göyün bir az.

## İcazə ver...

İcazə ver bir xoş gündə
Gəlim girim otağına.
Qulağını gətir söykə
Dərdlərimin dodağına.

Sənsiz nələr çəkdiyimi
Qoy danışsın o dodaqlar.
Yazıq könlüm yanmaq üçün
Sən adlı bir od adaxlar.

Sən insan yox, mələkəsən,
Sən ayrı bir biçimdəsən.
Səndən necə aralanım,
Axı mənim içimdəsən.

... İcazə ver, bir xoş gündə
Otağına gəlim sənin.
Gedim dərin bir yuxuya,
Qucağında ölüm sənin.

## Dağları

***Gəncə türməsinin əl boyda nəfəsliyindən baxanda çox da uzaqda olmayan dağlar könlümü dağladı...***

Qoşa barmaqlıqdan çölə baxıram,
Gözümə görünür Gəncə dağları.
Belə bir anımda Ulu Yaradan
Göz dağı yaradıb məncə dağları.

Könül, yar bu səddi, dur bayıra çıx,
Hanı gen dərələr, yurdda alaçıx...
Görürəm, gördüyüm alayarımçıx,
Seyr edə bilmirəm gencə dağları.

Düşdüm taleyimin köhlən atından,
Bezdim türməsindən, qazamatından.
Çıxanda mən yeddi qıfıl altından,
Ziyarət edərəm öncə dağları.

Həmişə könlünü tox istəyirsən,
Haqsızı ortada yox istəyirsən.
Kamil, göz açdın ki, çox istəyirsən,
Kimsə çox istəməz səncə dağları?

## SƏNƏTÇİLƏRİMİZ

### AŞIQ AYBƏNİZ LAÇINLI



*Aşıq Aybəniz atası Sabirlə*

Vəliyeva Aybəniz Sabir qızı 1963-cü ildə Laçın rayonunun Şamkənd sovetliyinin Nağdalı kəndində anadan olub. Orta məktəbdə oxuduğu illərdə şifahi xalq ədəbiyyatına və saza-sözə maraq göstərmişdir. Aybənizin saza-sözə olan marağı atası Sabir Vəliyevdən keçmişdir. Aybənizin anası Şərqiyyə xanım Sosialist Əməyi Qəhrəmanı, Qəhrəman ana, respublika səviyyəsində tanınmış bir qadındır.

Dədə Şəmşirin lent yazılarından, radioda olan çıxışlarından bəhrələnən Aybəniz 1980-ci ildə Kəlbəcər rayonundan olan tanınmış ustad aşıq Qəmkeş Allahverdinin şəyirdi olmuşdur. Aşıq Allahverdi aşıqlıq sənətinin bütün sirlərini Aybənizə öyrətmişdir.

1984-cü ildə Azərbaycanda fəaliyyətə başlayan "Aşıq Pəri" məclisinin sədri Narınc Xatun Aybənizi bu məclisə dəvət etmişdir. Aşıq Pəri məclisinə dəvət aldıqdan sonra "Pəri qızları" ilə tanış olub və bir neçə tanınmış ustad aşıqlarla: - Aşıq Əhməd Sadaxlı, Aşıq Mikayıl Azaflı, Aşıq Əkbər Cəfərov, Aşıq İmran Həsənov, Aşıq Aydın Çobanoğlu və başqa aşıqlarla dəfələrlə görüşmüşdür.

İlk dəfə Laçınlı təxəllüsü ilə çıxış edən şair Ağa Laçınlı IV Aşıqlar Qurultayında Aybənizlə görüşən vaxt Aybənizin ustadı Qəmkeş Allahverdi Ağa Laçınlıya müraciət edərək demişdir: - Ağa müəllim, ilk dəfə Laçınlı təxəllüsü ilə siz çıxış etmisiniz. Əgər izn versəniz, öz şəyirdim Aybənizə Laçınlı təxəllüsü verərdim. Bu təklifi Ağa müəllim məmnuniyyətlə qəbul etmiş və o gündən Aybənizin təxəllüsü Laçınlı olmuşdur.

Aybəniz istər rayon səviyyəli, istərsə də respublika səviyyəli tədbirlərdə dəfələrlə fəxri fərman və diplomlara layiq görülmüşdür. Laçın rayonunun işğalından sonra Bərdə rayonunda məskunlaşan Aybəniz Laçınlı öz yaradıcılıq fəaliyyətini bu gün də davam etdirir.

**XATİRƏ**

# «ƏN GÖZƏL DOSTLUQ SƏNİNLƏ OLANDIR»



*Hacı Nərimanoğlu və Polad Hüseyn*

2006-cı il yanvarın 1-də Laçın elimizin dəyərli yetirməsi Polad Hüseyn 30 yaşında Mingəçevir-Xaldan yolunda maşın qəzasında bu fani dünyadan köçdü.

Tale məni Qubadlıdan, onu Laçının Qarakeşiş kəndindən gətirib Mingəçevirdə qovuşdurmuşdu. Yaxından tanıyıb, ürəkdən bağlanmışdım ona. Elə gün olmazdı görüşməyək. "A qağa, sən darıxmırsan heç məndən ötəri?". Bəzən mən onun kabinetinə gedirdim. Çox zaman isə yaşda kiçik olduğuna görə o mənim yanıma gəlirdi. Kürün sahilində zövqlə bir ofis alıb təmir elətdirmişdi. Bir ildir ki, elə gün olmayıb Poladı yada salmayım. Yanaşı fotolarımızı masamın birinci siyirməsindən götürürəm, gözümün qabağına gətirirəm, ruhuna Allahdan rəhmət oxuyuram və nə qədər özümə toxdaqlıq versəm də, özümdən asılı olmayaraq gözlərim dolur, xatirələr dilə gəlir, danışır.

Mingəçevirdəki türk liseyində müdir müavini, sonra da «Zaman» qəzetində bölgə müxbiri işləmişdi. Özünü bu iki kollektivin - ailənin doğma üzvü hesab edirdi. Laçın camaatının cəmləşdiyi, yurd saldığı Ağcabədidəki Taxtakörpü qəbiristanlığında məzarı başından son və ən çətin ayrılan da elə bu ailələrin üzvləri oldu. «Zaman-Azərbaycan»ın baş direktoru Enes Cansever, müavini Osman Uçakdan başlamış Azərbaycanın bütün guşələrindən qara xəbərə yığışıb gələnlərin məzar başında qurduğu döv-

rələmə hıçqırtılı mənzərini görmək çox üzüntülü, kədərli idi. Poladın adını, xatirəsini yaşadan dost, həmkar sədaqəti, vəfası, ehtiramının rəmzi: «Zaman»ın Bakı təmsilçiliyində təzə, yaraşıqlı müasir iclas salonu Poladın adını daşıyır. Sağ olun, dostlar! İnsanların ruhuna girməyi, danışdırmağı, özünü sevdirməyi bacarırdı.

Mən Bakıya köçəndə dedim: bizə - AzərTAc-a informasiyalar yaz göndər, yer boşdu, gələcəkdə inşallah istəsən keçərsən bura. Bir neçəsini yazdı, hər dəfə bəzi düzəlişlər eləyirdim, deyirdim: «Bax belə çərçivəyə sal, rəsmi informasiya olmalıdı, bizdə hazır qəlibdi, müəllif mövqeyi gərək görünməyə»... Dedi: «Qutardım e siznən, mən sizin o qəlibinizə girə bilmərəm, o yazıda ki mən görünmürəm, onu heç yazmağa dəyməz».

Polad mənən azad, sərbəst oğul idi, davranışında da, danışığında da, geyimində də. Yalan nədi, bilməzdi. Qardaş-bacı çox, hamısının dərdini çəkirdi, əl tuturdu. Elə buna görə son vaxtlar azad sahibkarlıqla məşğul olmaq fikrinə düşmüşdü. Çox xeyirxah idi, son tikəsini dostla, ehtiyacı olanla bölməyə hazır idi....

- Cibində nə qədər pulun var?

- Bu qədər.

- Ver, üstün də mən düzəldəcəm.

Gedirdi bazara, meyvə-tərəvəz alırdı, Kürün sahilində yetim, əlil uşaqların dispanseri vardı, aparıb verirdik, çöldə-bayırda pay-püş eliyib gəlirdik: Oxxay! - deyirdi, - Allah, sən savab əməllərimizi çox elə, günahlarımızı bağışla. Gəlirdi: - Qağamsan, gəl bir Gəncəyə (ya Şəki, Bərdə) dəyək qayıdaq. Gəl sözündən çıx görüm də. Hər yerdə də özünə dost qazanmışdı.

AzTV-nin bölgə müxbiri Qaraş İsmayılın 50 yaşını qeyd eləmişdik, bir neçə gün keçmiş Qaraş Şəki yolunda qəzaya düşüb rəhmətə getmişdi. Ona da, mənə də çox ağır təsir etmişdi. Məni də alırdı yanına, gedirdik qəbrinin üstündə bir dua oxuyub gəlirdik, bayramlarda evlərinə baş çəkirdik. Sonra Mingəçevir şəhər məhkəməsinin sədri, yaxın qonşum, həmdəm, həmyaşıd olduğumuz Rüfət Həmidov 7 yaşlı madar oğlu ilə dənizdə batıb öldü. Ünsiyyət qurduğum bu dostların itkisindən dolayı mənə toxdaqlıq verirdi, Qurandan, hədislərdən misallar gətirirdi, haqqa qovuşanlar üçün çox üzüntü keçirməyin günah olduğun aşılayırdı. Ata-anası erkən dünyadan köçmüşdülər, cavan qardaşı qaçqınçılıqda kanalda batıb ölmüşdü, onların ağrı-acısı canındaydı hələ də. Bu da onun dilində ən çox səslənən sözlərdən biriydi: Allahın məsləhətinə şükür... bizim bizdən əvvəl gedənlərə borcumuz rəhmət oxumaqdı. Onun o zamankı təsəlliləri mənə həyan olub Poladsız ötən bu illərdə.

Şümal boy-buxununu, yaraşıqlı görkəmini üzündən əskik olmayan xoş təbəssümü, mərdanəliyi, mehribanlığı, prinsipiallığı, xeyirxahlığı, gözütoxluğu tamamlayırdı. Qardaşını heç nədən sifarişlə həbs eləmiş-

dilər. Haralara, kimlərin qəbuluna gedib çıxmamışdı, axır ki, onu təmizə çıxartdı. Namaz qılan, oruc tutan, kamil imanlı, inamlı, dili dualı idi, neçə nəfəri din-islam, Allah yoluna gətirmişdi. Nə qədər təcili iş, tədbir olsaydı, yenə də dəstamazını alıb namazını qılmamış getməzdi. Bu cavan yaşında təpədən dırnağa əsl müsəlman, imanlı Allah bəndəsi olmağıydı bir də onu mənə sevdirən.

Dədəm Mingəçevirə bizə gəlmişdi. Polad evimizdə Qurandan şirin avazla «Yasin»i oxuyub anamın ruhuna bağışladı. Kişi o vaxtdan könül bağladı ona. Tez-tez zəng eliyirdi kişiyə, halını soruşurdu. Dədəm ötən həcc ziyarətindən qayıdıb gələndə də, Ramazanda da onu soruşdu: - Mənim Polad balam belə iş eləməzdi axı, heç səsi gəlmir nə vaxtdı.

- Köçüb... Türkiyəyə gedib, - dedim.

- Yenə də... o belə iş eləməzdi, - dedi...

Şirin qələmi vardı, tumsatan qarı ilə söhbəti ilin ən yaxşı yazısı olmuşdu, orijinal mövzular seçirdi. Bir də görürdün hansısa rayonun ucqar kəndindən səsi gəlir, sadə bir insan sorağındadı.

Ağdaşdan nəcib bir ailənin qızı ilə ailə qurmuşdu, Tanrı 4 övlad payı vermişdi - Süheyla, Ömər, Fatih, Yavuz. Dostları STV-də haqqında gözəl bir veriliş hazırlamışdılar. Ömərin bu sözləri heç yadımdan çıxmır: «Atam gedib cənnətdə ev qurmağa ki, biz gedəndə orda hamımız bir yerdə qalaq həmişəlik... Bu Poladın verdiyi imandı, tərbiyədi. Telefonuma tez-tez ibrətamiz mesajlar göndərərdi, bu da son mesajıdır: «Ən möhtəşəm gecə gündüzü olanındır. Ən güclü sevgi heç qeyb olmayandır. Ən mutlu insan xatırlananandır. Ən gözəl dostluq səninlə olandır. Neçə-neçə bayramlar!» 31 dekabr, 2005, 20.29.58. Dalınca telefon zəngi. Danışırıq, bayramlaşırıq, ilin son dəqiqələrində yenə də təkrar zəngləşirik, - Nə isə yaman darıxıram bu gün, Yeni ili keçirim, gələcəm Bakıya - deyir.

Səhəri - Yeni ilin ilk günü gələn bu qara xəbərin üzüntüsünü Poladı tanıyanlar hər zaman yaşayacaqlar, onu heç zaman unutmayacaqlar, onun üçün rəhmət dualarını heç vaxt əsirgəməyəcəklər. Allah övladlarına xoşbəxt, xeyirli tale nəsib eləsin!

Mənə Poladın adı ilə daha da doğmalaşan «Zaman»da bir dəfə yazdığımı təkrar edirəm: Sən özünə səni unutmayan çoxlu dostlar qazandın, cavan yaşında hər zaman xatırlanan insanlardan biri olmaq haqqını qazandın, Polad! Yerin behişt olsun! Son mesajından çıxardığım bir cümləni olduğu kimi sənə ünvanlayıram, Polad qardaşım: «Ən gözəl dostluq səninlə olan idi».

Polad kimi namuslu, qeyrətli, imanlı övladlara ən çox sənin ehtiyacın vardı, Vətən! Başın sağ olsun...

**Hacı NƏRİMANOĞLU,**
***"Zəngəzur" Cəmiyyətləri Birliyinin sədri***

**TƏBRİK**

## ŞİRİNDİL ALIŞANLI RUSİYADA AKADEMİK SEÇİLİB

Hörmətli eloğlumuz, ədəbiyyatşünas və naşir, AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun şöbə müdiri, “Elm” nəşriyyatının direktoru Şirindil Alışanlı Rusiyanın nüfuzlu elm ocağının - Estetika və Azad Sənətlər İctimai Akademiyasının akademiki seçilib. Bu haqda məlumatı tanınmış rus alimi, görkəmli estetik, akademik Yuri Borev verib.

“Laçın yurdu” jurnalının kollektivi Şirindil müəllimi yüksək ad alması münasibətilə səmimi qəlbdən təbrik edir, ona möhkəm cansağlığı, elmi fəaliyyətində və şəxsi həyatında uğurlar diləyir!

**GƏNC ALİMLƏRİMİZ**



## PƏRVİZ İSMAYILOV

İsmayılov Pərviz Xosrov oğlu 25 sentyabr 1982-ci ildə Laçın rayonunun Daşlı kəndində müəllim ailəsində anadan olub.

1988-ci ildə Laçın rayon Daşlı kənd orta məktəbinin 1-ci sinfinə gedib. Laçın rayonunun erməni qəsbkarları tərəfindən işğalı səbəbindən ailəsi ilə birlikdə Bakı şəhərində məskunlaşan Pərviz təhsilini Xətai rayonunda təşkil olunmuş Laçın rayon 28 saylı orta məktəbində davam etdirir və 1999-cu ildə həmin məktəbi bitirərək Azərbaycan Dövlət Pedaqoji Universitetinin filologiya fakültəsinə qəbul olunur. O, 2003-cü ildə universiteti fərqlənmə diplomu ilə başa vurur. Lakin bununla kifayətlənməyərək bakalavr təhsilini magistr təhsili ilə tamamlamaq qərarına gəlir və məqsədinə çatır.

2005-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin magistraturasını da fərqlənmə diplomu ilə bitirir, elə həmin il aspiranturaya qəbul olunur. Oxuduğu müddətdə elmi məqalələri çap olunan Pərviz İsmayılov 2008-ci ildə aspiranturanı da müvəffəqiyyətlə başa vurur.

Əməkdar elm xadimi, Şöhrət ordenli, Əməkdar müəllim, filologiya elmləri doktoru, professor Həsən Mirzəyevin elmi rəhbərliyi ilə “Kəlbəcər rayonu onomastik vahidlərinin linqvstik təhlili” mövzusunda namizədlik dissertasiyasını müdafiə edərək filologiya üzrə fəlsəfə doktoru alimlik dərəcəsi alır.

Hal-hazırda Laçın rayon 28 saylı orta məktəbində Azərbaycan dili və ədəbiyyatını tədris edən gənc alim Prezident yanında Strateji Araşdırmalar Mərkəzində elmi fəaliyyətlə də məşğuldur.

## ONLAR ƏSİR DÜŞÜBLƏR

Temir Zülfiqar oğlu, Mötəbər Dadaş oğlu və Ağaşirin Temir oğlu İbrahimovlar Laçın rayonunun Oğuldərə kəndində anadan olublar. Ağaşirin Temirin oğlu, Mötəbər isə Temirin bacısı oğludur.

1924-cü ildə anadan olan Temir İbrahimovun əsas məşğuliyyəti öz şəxsi təsərrüfatı olub. O, ağsaqqalığı ilə yaşlıların, şirin zarafatları ilə cavanların hörmət və rəğbətini qazanmışdı.


*Mötəbər İbrahimov*

1954-cü ildə anadan olan Mötəbər İbrahimov 1969-cu ildə Oğuldərə kənd 8 illik məktəbini, 1971-ci ildə isə qonşu Qorçu kənd orta məktəbini bitirib. 1972-74-cü illərdə Sovet Ordusu sıralarında hərbi xidmət keçdikdən sonra o da öz şəxsi təsərrüfatında işləyib.

1962-ci ildə anadan olan Ağaşirin İbrahimov 1979-cu ildə orta məktəbi bitirmiş və 1980-82-ci illərdə həqiqi hərbi xidmətdə olmuşdur. Hərbi xidmətdən qayıdan Ağaşirin atası Temir kişiyə təsərrüfat işlərində kömək etmişdir.

1992-ci ildə Laçın rayonunun işğalı zamanı doğma Oğuldərə kəndini məcburi tərk edən Temir İbrahimov oğlu Ağaşirin ilə birlikdə Qax rayonunda, bacısı oğlu Mötəbər isə Laçın rayonu ilə qonşu olan Kəlbəcər rayonunda məskunlaşır.

Vətən həsrətinə dözməyib, ayrılığa tab gətirməyən Temir kişi bir müddətdən sonra ata-baba yurdu olan Oğuldərə kəndinə qayıdır. Bu zaman onun oğlu və bacısı oğlu da onunla bərabər kəndə dönürlər.

1993-cü ildə Kəlbəcər rayonu işğal olunan vaxt Temir qohumları, həmkəndliləri və hərbiçilərlə mühasirədə qalır. Mühasirədən çıxmaq məqsədi ilə Kəlbəcər rayonunun dağlarına üz tuturlar. Bir neçə gün gündüz gizlənib, gecə yol gedirlər. Onlar Kəlbəcər rayonunun Çayqılışlı kəndində qəfil erməni quldurları ilə üz-üzə gəlirlər. Döyüş başlayır. Bir neçə nəfər xilas ola bilsə də, Temir kişi, oğlu Ağaşirin və bacısı oğlu Mötəbər ermənilərə əsir düşürlər.

**Vəliş ZİRVƏLİ**

## ƏKS-SƏDA



*Məhəmməd Səyyah (sağda)*

***

Günlərin bir günündə Məhəmməd Səyyah Kəlbəcərdən, daha dəqiq desək, Çovdar-Şəkərəmdən Laçına qayıdırmış. Mıxtökən dağından keçib İsmayıl su içən adlı əraziyə yetişəndə borana düşür. Baxır ki, hər tərəf çən-duman, özü də tək-tənha. Fikirləşir ki, birdən ölüb-eləyərəm, ölümüm müəmmalı qalar. Əli heç yana çatmayan şair qələmə əl atır. Aşağıdakı şeiri yazır ki, başına bir iş gəlib-eləsə əsl həqiqət camaata agah olsun.

### DAĞLAR

Qanı qanla yumayıblar,
Gəl qan etmə qana, dağlar.
Dost, mühasib aralıdır,
Kimdi dərdi qana, dağlar?

Azalmır qəlbimdən ağrım,
Mıxtökən olubdur Ağrım.[1]
Saz olmasa çatlar bağrım,
Ömür yetər sona, dağlar.

Bir qardaşım qarlı daşdı,
Biri qəlbimə sirdaşdı.
Sağ olsa da gözüm çaşdı
Baxmaqdan hər yana, dağlar.

Üstümə düşəndə toran,
Çox görmüşəm sizdə boran.
Olmayın Səyyahı yoran,
Qan uddurman ona, dağlar.

***Təqdim etdi:***
**Bayram İBRAHİMOV**

[1] Ağrı dağı nəzərdə tutulur.

ŞƏHİDLƏRİMİZ

## QƏHRƏMANIN SON DÖYÜŞÜ



Məmmədov Ədalət Həsən oğlu 1961-ci il oktyabırın 29-da Laçın rayonunun Zabux kəndində anadan olmuşdur. O, 1968-ci ildə orta məktəbə getmiş, orta təhsilini başa vurduqdan sonra 1979-1981-ci illərdə əsgəri xidmətdə olmuşdur. Ədalət 1983-cü ildə Mərdəkandakı milis (polis) məktəbini bitirib Laçın rayon Daxili İşlər Şöbəsində işə girir. Baş serjant Ədalət Məmmədov 1992-ci ildə başqa polis işçiləri kimi doğma Laçın uğrunda döyüşlərə yollanır. Seyidlər, Tığik, Bilindüz, Narışlar, Pircahan, Kürdhacı, Oğuldərə və s. kəndlər uğrunda gedən döyüşlərdə qəhrəmancasına vuruşur.

Çoxlu sayda erməni döyüşçüsünü məhv edən Ədalət Məmmədov 1992-ci il oktyabırın 11-də Hoçaz yüksəkliyinin alınması uğrunda aparılan döyüşlərdə qəhrəmancasına şəhid olmuşdur. Məzarı Göyçay rayonundadır. İki övladı yadigar qalıb: qızı Gülnarə və oğlu Ziyadxan.

Dostu və cəbhə yoldaşı, Qarabağ müharibəsi veteranı, polis kapitanı **Əli Hüseynovun xatirələrindən:**

"Ədalətlə tanışlığım 1979-cu ilə gedib çıxır. İkimiz də eyni vaxtda bir qatarda hərbi xidmətə yollanmışıq. Daha sonra 1983-cü ildə Daxili İşlər orqanlarında çalışmağa başlamışıq. İşlədiyimiz dövrdə Arif Heydərov adına kiçik rəis heyəti hazırlayan kursda da bir yerdə oxumuşuq. Daha sonralar isə döyüş yolumuz bir yerdən başladı. Səfian kəndi, Hadrut rayonu istiqamətlərində, Zabux kəndinin müdafiəsində də Ədalətlə bir yerdə olmuşuq. Laçının işğalından sonra Kəlbəcər ərazisindən keçərək Laçın uğrunda yenidən döyüşlərə qoşulmuşuq. Hoçaz dağının alınması əməliyyatında da çox ağır döyüş oldu. İndi çox adam deyir ki, Hoçaz dağının alınmasında iştirak etmişəm Bu döyüşdə Laçın Polis Şöbəsindən 32 nəfər iştirak edirdi. Biz təkcə ermənilərə qarşı deyil, həm də rus ordusuna qarşı döyüşürdük. Bunu ələ keçirdiyimiz su qablarının üzərində rus adlarının yazılması təsdiq edirdi. Hoçaz döyüşündə 4 tank, 1 PDM ( piyadaların döyüş maşını ) ələ keçirmişdik. Həmin texnikaların üzərində də rus adları və Voronej şəhərinin adı yazılmışdı. (1991-92, dembil Voronej). Hoçaz dağını böyük çətinliklə ələ keçirdik. Həmin döyüşdə heç bir itki vermədik, ancaq biz dağın alınması ilə qane ola bilməzdik. Hərəkət eləməyə

başladıq. “Telesentr” yüksəkliyini və Sus kəndini aldıqdan sonra mövqeləri Milli Orduya təhvil verib, yenidən irəli doğru hərəkət eləməyə başladıq. Bir müddətdən sonra bizə məlum oldu ki, erməni ordusunun mühasirəsinə düşmüşük. Milli ordu mövqeləri tərk edib, ermənilər isə bizi arxadan mühasirəyə alıblar. Böyük çətinlik bahasına olsa da o mühasirədən çıxdıq və Ədalət o döyüşdə snayper gülləsindən qurtula bildi. Bundan sonra çox mühasirələrə düşmüşük. Elə bil ki, kimsə qəsdən Laçın polisini mühasirəyə salıb son nəfərinə kimi qırmaq istəyirdi. Mən sizə açıq həqiqəti deyirəm, inanın. Son döyüşümüz də çox ağır keçdi. Hocaz dağında möhkəmləndikdən sonra ermənilər ön tərəfdən 7 tank, 1 top, 2 qrad qurğusu ilə meşə idarəsinin həyətindən, 2 topla Cağazur kəndi istiqamətindən, 3 top, 1 qradla Hacılar, Sadınlar istiqamətindən, 1 TŞK, 1 tank, 6 km-ə qədər məsafəni vuran topla hücuma keçdilər. Hər bir insan üçün 1 mərmi atılırdı. Silah, texnika cəhətdən xeyli üstün olmalarına baxmayaraq, 7 tankla müdafiə istehkamımızı yara bilmədilər. Döyüş bir az sakitləşdikdən sonra rəhmətlik Oqtay (Oqtay Güləliyev) dedi ki, qalan qüvvələr keçib qayanın arxasında mövqe tutsunlar. Mən mərmi düşən tərəfdə idim, həmin an keçib uzandım, heç 45 saniyə çəkmədi ki, hansısa mərmi Oqtayın, Ədalətin və Əşrəf Məmmədovun həyatına son qoydu. Bir dost kimi Ədalət və Oqtay əvəzsiz insanlar idilər. Dünyada Ədalət kimi yoldaşlığı olan ikinci bir insan tanımıram, mən bunları yazı və yaxud müsahibə xətrinə demirəm, həqiqət olduğu üçün deyirəm.

Hələ 1983-cü ildə kursda olduğumuz müddətdə Ədalətlə münasibətlərimiz xeyli yaxınlaşmışdı. Elə bilirdilər ki, əkiz qardaşıq, bəzən bizi bir-birimizdən ayıra bilmirdilər, dəyişik salırdılar. Quruluşumuz, boyumuz eyni idi, mən bir az ağbəniz idim. Eyni geyinirdik: ağ köynək, ağ “furajka”. Laçının özündə belə bizi dəyişik salırdılar. Bir dəfə Laçında bir nəfər qarşımı kəsdi ki, kostyum tikdirmisən, gəl apar. Mən dedim ki, bir yaxşı-yaxşı bax, bəlkə dəyişik salırsan. Baxıb dedi ki, ola bilər, Ədalətə deyərəm gəlib götürər. Bir dəfə də bir nəfər dedi ki, su kranlarını gətirmişəm, gəl apar. Bax belə maraqlı epizodlar... Təəssüflər olsun ki, Ədaləti, Oqtayı, onlar kimi yüzlərlə oğullarımızı itirsək də, üzərimizə düşən vəzifəni axıracan başa çatdıra bilmədik. Dostumun balası olaraq Ziyadxanı öz balalarımdan ayırmıram. O da, Anar da (Oqtay Güləliyevin oğlu) mənə dost əmanətidirlər. Onlara atalarının adını şərəflə daşımağı arzulayıram. Ziyadxan atasına layiq övlad olsun, onun ad-sanını şərəflə qorusun.

**Siyavuş ƏMİRLİ**

**XATİRƏ**

## "LAÇIN DAĞLARINA MƏKTUB" ŞEİRİNƏ GECİKMİŞ CAVAB



Laçın rayonunun İmanlar kəndində ömür sürmüş əvəzedilməz ağsaqqal, indi haqq dünyasına qovuşan Şahverdi Şahverdiyevə ünvanlanmış bu "məktub - şeir" hər kəsi həyəcanlandırır, o cümlədən də məni.

Məktub şeirlə yazıldığına görə şeirlə də cavablandırmaq lazım idi. Lakin düşündüm ki, şeirə şeirlə cavab verməkdən ötrü Şahmar ürəyi, Şahmar istedadı, Şahmar məhəbbəti gərəkdir. Bunun mümkünsüzlüyünü dərk edərək istədim cavabı nəsrlə yazım, onun da Şahmar yazdığı səviyyədə olmayacağını anlayaraq fikrimi dəyişdim. Cavab isə mütləq yazılmalıydı, yoxsa rahatlıq tapmayacaqdım. Bəs necə? Bəlkə "deyişmə" formasında? Görəsən, yerinə düşərmi? Axı "deyişmə"nin mənə məxsus hissəsi sonralar yazılıb.

Bir neçə dəfə "Mədəniyyət" qəzetinin redaksiyasına gedib yazdıqlarımı Şahmara oxumaq istəsəm də, ürək etməmişəm. İndi isə hesab edirəm ki, Şahmarı anmaq üçün bu da bir vasitədir, daha doğrusu, şairin müqəddəs ruhu ilə söhbətdir.

Əziz Şahmarım, səni həmişə, hər an xatırlayacağıq, bu yazımla əziz xatirəni bir daha yad edirəm.

***Şahmar***
Laçından tərpəndim söküləndə dan,
Titrədim keçəndə İlanqayadan.
Kəsdi bənd-bərəmi Talışvurulan,
Heyrət muzeyidir dağlarım mənim.

***Sabir***
Laçından tərpəndin söküləndə dan,
Keçdin əfsanəvi İlanqayadan.
Kəsməz bənd-bərəni Talışvurulan,
Qeyrət məskənidir dağlarım mənim.

***Şahmar***
Çalbayır, Uzunyal, Çilgəz, Mıxtökən,
Sizi gözlərimdən oğurladı çən.
Elə zənn elədi bədnəzərəm mən,
Tutuldu qarşımda yollarım mənim.

***Sabir***
Çalbayır ürəyim, canım Mıxtökən,
Səni gözlərindən oğurlamaz çən.
Ötən günlərimi hər andıqca mən,
Tökülür varağa göz yaşım mənim.

***Şahmar***
İmanlar yurdunda gəldim imana,
Hacxanlı, Qovuşuq qonağa ana.
Deyirəm ya qismət, bir də o yana
Görən düşəcəkmi güzarım mənim?

***Sabir***
İmanlar yurdunda oldun qonağım,
Hacxanlı, Qovuşuq dilim-dodağım.
Bəhərli çöllərə çatmaz sorağım,
Xəzana dönübdür baharım mənim.

***Şahmar***
Qorqud yadigarı Şahverdi dədə,
Sözlə ovsunlayıb məni o vədə.
Perikmiş bülbüləm, qalıb Şəlvədə
Şehli gülüm mənim, gülzarım mənim.

***Sabir***
Qorqud yadigarı ağlar, sızıldar,
Sənin ürəyintək yanar, cızıldar.
Qürbətdə üşüyər qərib məzarlar,
Həsrətdi Şəlvəyə sağlarım mənim.

***Şahmar***
Behiştdən gözəlmiş Cəhənnəmdərə,
Cənnət deyəydilər gərək bu yerə.
Nərdivan dağıyla qalxdım göylərə,
Dünyaya sığmadı vüqarım mənim.

***Sabir***
Cəhənnəmdərəyə cənnət demişdin,
Özünü görmüşdün sanki behiştin.
Göylərə ucalmaq deyilmiş çətin,
İndi şəhid olub Vüqarım mənim.

***Şahmar***
Yadımdan çıxarmı o çörək, o duz,
Ellər səxavətli, çeşmələr bumbuz.
Başyurda baxaram yüz il ac-susuz,
Tükənməz səbirim, qərarım mənim.

***Sabir***
Yadından çıxmadı o çörək, o duz,
Şairin qəlbini duymaz duyğusuz.
Başyurda kim baxar indi ac-susuz? -
Acdan xəbərsizdi toxlarım mənim.

***Şahmar***
Toyuqtöküləndən ehmallı keçdim,
Qantəpər çinlədim, Qırxbuğum biçdim,
Sütül baldırğanla qaynar süd içdim,
Dağlarda dağlandı dağlarım mənim.

***Sabir***
Qonaq kimi gəldin, qardaştək getdin,
Gedişinlə bizi qəmə qərq etdin.
Palıd ağacıydın, şəhərdə bitdin,
Kəndləri axtardı soraqçım mənim.

***Şahmar***
Çiçəklər loğmanı Raziyə nənə,
Çəməni çəmənə qatırmı yenə?
Çilədağ, kəkotu yığıbmı mənə,
Dururmu çaşırım, lilparım mənim?

***Sabir***
Çiçəklər loğmanı Raziyə nənə
Çəməni çəmənə qatmayır yenə.
Kəkotu, çilədağ yığmayıb sənə,
Daha bar gətirmir bağlarım mənim.

***Şahmar***
Mən Leyli demişdim Laçıngüneyə,
Vəfasız bilməsin gəlmirəm deyə.
Ürəyim o vaxtdan dönüb kəkliyə,
Başlayıb Məcnunluq çağlarım mənim.

***Sabir***
Sənin Leylin - Laçıngüney girovdu,
Mıxtökənin başı dümağ qırovdu.
Bir gün eşidərik düşmən qovuldu,
Gələr başıuca çağlarım mənim.

***Şahmar***
Xeyli var həsrətəm Qəbirliyala,
Ölməyə nə var ki, belə yer ola.
Qorxdum ölüb-qalım, anam hay sala,
Car çəkə:
- hardadır Şahmarım mənim?!

***Sabir***
Ruhun qovuşdumu Qəbirliyala?
Mələk bacı yaman dalıb xəyala.
Yaddan çıxmaz min qış keçə, yay ola-
Qəlblərdə yaşayır Şahmarım mənim.

Əziz oxucular, siz necə, Şahmar Əkbərzadəni unutmamısınız ki?!



**Sabir NOVRUZOV,**
***İmanlar kənd ümumi orta məktəbinin müəllimi***



***Bəxtiyar Vahabzadə, Şahmar Əkbərzadə, Əhməd Şmidte və Ağəddin Mənsurzadə***

**TƏƏSSÜRAT**

## BALDIRĞAN HARAYI

*Bilməm mən qədiməm, ya dünya qədim,*
*İndi düşüncəyəm, əvvəl nə idim....*
*Dünyanın sirrini bilmək istədim,*
*Mən özüm özümə elə sirrikən!*

*B.Vahabzadə*

İnsan-kəşf olunmayan sirli bir müəmma. Bu müəmmanın içərisində sevinc və kədər, xoşbəxtlik, fəlakət, nələr nələr...

Yeni doğulmuş körpəni ana rahatlayıb əmizdirəndə körpə gözlərini ananın gözlərinə dikib mehriban, nəvazişli baxışından tökülən ilahi məhəbbətə sahib olur. Anaya müqəddəs sevgi də elə o andan başlayır. Bu müqəddəs məhəbbət böyüyən körpənin ruhuna pillə-pillə ilk gördüyü evdən, həyətdən, ayaq tutub gəzə bildiyi torpaqdan, ərtaf aləmdən ağ kağız kimi təmiz və pak olan yaddaşına hopur.




Qırxqız adlı əzəmətli bir dağ vardı. O dağ yaradıcı insanların əsərlərində həmişə tərənnüm olunub. Böyük Qafqaz dağ silsiləsində - Şahdağ, Babadağ, Kiçik Qafqaz dağ silsiləsində - Dəlidağ, Qırxqız, Qoşqar, Murov dağları bir qürur mənbəyi kimi Azərbaycan xalqının simvoludur. Qürur və məğrurluq simvolu olan dağları öz sirli-sehirli varlığı ilə yağı düşmənə təslim edib yetim qoymaq, yalnız təəssüflənmək və yaxud onun həsrətilə qəriblikdə ölmək, eləcə də dünənimizlə öyünüb, keçmişin kölgəsində yatmaq mənəvi cılızlıqdan başqa bir şey deyil.

Hal-hazırkı vəziyyətdə o dağların, yəni Qırxqızın, Çilgəzin, Dəlidağın, Sarıbabanın Qırxqulaq, Arxud, Pəriçınqılı nişanələrini başqa bölgələrdə görəndə kövrəlməkdən savayı əlimizdən bir şey gəlmir.

Qırxqız dağının ətəyində bir kənd vardı. Bu kənddə sadə, zəhmətkeş, qarışıq dünyanın qarışıq işlərindən xəbərdar olmayan, səhərin açılmasından ruhlanan, axşamın düşməsindən rahatlanan, gündəlik dolanışığına şükür edən, böyüklərə hörmət, kiçiklərə mərhəmət göstərən insanlar yaşayırdı. Qırxqız dağının ətəyindəki bu kənddə daha zəhmətkeş, daha qayğıkeş bir ailə də vardı. Halal zəhmətin nəticəsi olaraq bu ailənin üzvlərindən biri öz dövrünün ən ali tituluna - Sosialist Əməyi Qəhrəmanı adına layiq görülmüşdü. Bu, on bir uşaq böyüdən Qəhrəman Ana idi.

Qəhrəman Ananın anası - məğrur, əzəmətli sıldırım qayaları, dərin dərələri, sıx ormanları, şəfaverici buz kimi şəffaf bulaqlarından süzülüb axan dəlisov çayları, təbii bitkiləri ilə öz övladlarının loğmanı olan - Qırxqız dağı. Bu dağ sirli-sehirli Ana idi. Övladlarına zavallı ana nələr vermirdi... Çox düz deyilib: "Ana südü, dağ çiçəyi" min bir dərdin dərmanı. İnsanlar yaşadığı ərazidə hansı tamı dadmırdılar. Yazın ilk günlərindən təbiət öz övladlarına yarpız, cincilim, meşə keşnişi, su qıjısı, qoyunqulağı, quzuqulağı, qırxbuğum, yol otu, yemlik, əvəlik, xazas, danaqıran, çaşır, şoşan, kortum, dəvədabanı, kəkotu, qantəpər, çobanyastığı, zirə, qatırquyruğu kimi baldırğanı da bir loğman olaraq bəxş etmişdir.

Ona görə də o dağların övladları heç vaxt eynək taxmır, şəkərli diabet, virus mənşəli hepatitlər nə olduğunu bilmirdilər.

Baldırğan sözünün kökündə bal sözü var. Bal arısı balı min bir çiçəkdən çəkir. Baldırğan ona görə dəyərlidir ki, təbiət onu min bir dərdin dərmanı kimi yaradıb, min bir dərdin dərmanı olması ilə bərabər, həm də kövrək bitkidir.

Qırxqız dağının ətəyindəki o kəndi və bütövlükdə o məmləkəti ağılagəlməz qəfil bir "qasırğa" tutdu. Bu qasırğa heç bir təbii qasırğalara bənzəmirdi. Bu "qasırğa" dünya bərqərar olandan bəri görünməyən, mislibərabəri olmayan, insanları öz yurd-yuvalarından əbədi ayıran, yurd yeri ilə yurddaşlar arasında qorxulu bir sədd çəkən qorxunc bir "qasırğa" idi.

Bu qorxunc "qasırğa"dan insanlar hara gəldi baş götürüb qaçırdılar. Nənələr qırışlı və damarlı əlləri ilə bağladığı boxçaları "xəzinə" hesab edərək özləri ilə götürməyə can atırdılar. Bu boxçalarda nələr yox idi. İpdən, sapdan tutmuş toxumlara qədər hər şey. O toxumlar yalnız o torpaqda göyərə bilərdi. Gicitkən, meşə keşnişi, zirə, baldırğan və s. toxumları boxçalarda düyülmüşdü.

Mərkəzi Aran rayonlarının birində məskunlaşmış Qırxqız dağının ətəyindəki o kənddən olan həmin zəhmətkeş ailənin üzvləri köçkün düşdükləri dövrün on ikinci baharında yaşadıqları olacağın arxa tərəfində, sakit bir yerdə sanki möcüzə ilə rastlaşdılar. Qəhrəman Ananın sükut içərisində baldırğan komasının yanında dayanıb qeyri-adi həyəcanla axıtdığı göz yaşı və qəlbindəki iztirabları duyan ailə üzvləri Ananın başına cəmləşdilər. Ananın başına cəm olan ailə üzvləri aran rayonunda boy atmış baldırğanın dövrəsində ani bir çaşqınlıqdan sonra elə bil ayıldılar. Hər birinin üzündən gilələnən göz yaşları sanki on iki ildən sonra Qırxqız dağının ətəyindəki o kəndin ziyarəti idi. Burada nələr baş verdiyini sözlə ifadə etmək mümkün deyil. Böyük Yaradanın yalnız insana bəxş etdiyi ən dəyərli və qüdrətli söz burada çox aciz və imkansızdır.

Bu baldırğan koması həmin an Vətənin özü idi: Dağı, dərəsi, çayı, meşəsi, qayası bütövlükdə işğal altında olan bir məmləkət! ...

İnsan ağlı cənnət və cəhənnəmin yalnız o dünyaya məxsus olduğunu düşünürdü. Bir el deyimi vardı: “Ölməmisən, görməmisən”. Sən demə, diriykən ölmək də varmış, görmək də. Cənnət nə olduğunu bilmək üçün gərək cəhənnəmə düşəsən, cənnətdə qalsan o sənin üçün həmişə adi olacaq.

İnsan - planetin dərin sirlərinə yiyələnən, qalaktikaları kəşf edən müəmma.

İnsan - xöşbəxtlik içərisində özünü əbədi xoşbəxt, bədbəxtlik üz verəndə əbədi bədbəxt bilən müəmma.

Baldırğan komasının ətrafına cəmləşən bir məcburi köçkün ailəsinin keçirdiyi hiss və həyəcanı əgər duya bilsəydi dağlar öz yerindən oynayar, tufan qopardı ki, ey insan, özünü gör və dərk et.

**Vidadi SABİROĞLU**

## QARABAĞ QAZİLƏRİ



### NİYAMƏDDİN İMRANOV

İmranov Niyaməddin Tufan oğlu 7 may 1975-ci ildə Laçın rayonunun Xaçınyalı kəndində müəllim ailəsində anadan olub. 1992-ci ildə orta məktəbi bitirib. Evin tək oğlu olmasına baxmayaraq 1993-cü ildə könüllü surətdə ordu sıralarına yollanıb. İlk vaxtlar Laçın alayının tərkibində Cəbrayıl rayonunun ərazisində - Xələfli, Yarəhmədli, Minbaşılı, Mahmudlu istiqamətlərində, daha sonralar isə Ağdam və Tərtər rayonları istiqamətlərində döyüşlərdə iştirak edib.

Ailəlidir bir övladı var.

Niyaməddinin cəbhə xatirələrindən: - “Rəhmətlik Elçinin bölüyündə olarkən 1993-cü il dekabrın 28-də Ağdamın Salahlı-Kəngərli kəndində mühasirəyə düşdük. Qarabağ kanalının üstündə 4 saata qədər ağır döyüş getdi. Dörd bir tərəfdən ermənilər bizi mühasirəyə almışdılar. 60-70 nəfərə yaxın itki versək də, təslim olmadıq. Gecə ara sakitləşəndə Elçin dedi ki, ön hissəni yoxlayıb qayıdıram. Bir az keçəndən sonra partlayış səsi eşitdik, durub irəli getdik ki, Elçin və başqa iki tağım koman-

dirimiz minaya düşüb. O döyüşdə bizim mühasirədən çıxmağımıza kömək edən alay komandirinin müavini Sabir Xıdırov oldu. Sonra isə N saylı hərbi hissədə Cəfərov Nadirin komandir olduğu bölüyə göndərildim. Həmin bölük laçınlıların sayı çox olduğuna görə "laçınlılar" taboru adlanan taborun tərkibində idi. Hətta o vaxtlar briqada komandiri Aydəmirov Yaşar III tabora çox güvənirdi, ən ağır döyüşlərə bizi göndərirdi. Füzuli rayonunun Seyid Əhmədli kəndi uğrunda gedən döyüşlərdə Cəfərov Nadirin başçılıq elədiyi tabor xüsusilə qəhrəmanlıq göstərdi. 1994-cü ildə bizi yenidən Ağdamın Təzəkənd, Tərtərin Seysulan kəndləri uğrunda gedən döyüşlərə göndərdilər. Laçın taboru yenə də böyük rəşadət göstərdi. Bir maraqlı epizodu deyim ki, biz Füzulidə olarkən N saylı xüsusi təyinatlı taborun komandiri Cəfərov Nadirdən kömək istədi. 150 nəfər xüsusi təyinatlı dəstənin saxlaya bilmədiyi bir mövqeyi 15 nəfər laçınlı döyüşçü bir neçə həftə saxlaya bildi və düşmənə təslim etmədi. Bəlkə də torpaqlarımızın hələ işğaldan azad edilmədiyi bir məqamda qəhrəmanlıqdan danışmaq yerinə düşmür. Amma biz o döyüşlərdən qalib çıxacağımıza inanırdıq. Təəssüf ki, arzularımız həyata keçmədi. İndi Laçın üçün çox darıxıram, Laçın uğrunda yenidən vuruşmaq üçün Ali Baş Komandanın əmrini gözləyirəm."

Açılan güllərin ətrinə uydum,
Axan şəlalənin səsini duydum.
Baxan bu gözləri, həsrətdə qoydum,
Laçınlı günlərə dönmək istərəm.

Zəmanə bəs niyə sındırdı bizi?!
Aldı əlimizdən Vətənimizi.
Sanki kor eylədi gözlərimizi,
Laçını son dəfə görmək istərəm.

Həsrətli ürəyim arzuyla dolur,
Arzular çiçəktək saralır, solur.
Ölüm də sevgitək vəfasız olur,
Laçınlı günlərə dönmək istərəm.

Niyaməddin yenə şam kimi yanır,
Bəzi nankorlarsa Vətənin danır.
Biz burda, Laçınsa uzaqda qalır,
Laçını döyüşüb almaq istərəm.

**POEZİYA**



**Eldar İSMAYIL**

## AY QAÇQIN, AY QARDAŞ

Ay qaçqın, ay qardaş, a dərdin alım,
Hərə öz kefində, səfasındadı.
Damağı çağ olan hardan bilsin ki,
Qaçqın öz canının cəfasındadı.

Soyuq baxışların altda əsirsən,
Bilmirəm qaçqınsan, yoxsa əsirsən.
Kimdən inciyirsən, kimdən küsürsən?-
Hərə öz başının qovğasındadı.

Yağışı quruyub bulud verənin,
Ayranı calanıb qurud verənin.
Bir zaman qaçqına umud verənin
Çoxusu vəzifə davasındadı.

Bəs hanı halını "qanan oğullar",
Sinəsinə döyən "canan oğullar"?
Sizin dərdinizə yanan oğullar
Deputat eşqində, havasındadı.

Eldar, nə yaşamaq belə həyatda...
Koroğlu piyada, Həmzə Qıratda.
Adam var milyonu başının altda,
Gözləri qaçqının tavasındadı.

## QƏMLƏNDİM

***Yeni ilin gəlişi münasibətilə konsertlər, atəşfəşanlıq, deyib-gülmək ara vermir. Şadlanmaq yaxşı şeydir. Yüz illərdən bəri düşmənə tapdaq olan torpaqlarımızın taleyi bu şadyanalığa nə deyir?***

Hər kəs yeni ili bayram elədi,
Şuşanı yadıma salıb qəmləndim.
Ekranda çal-çağır ütdü səbrimi,
Topa bulud kimi dolub qəmləndim.

Mən düşən bu oyun başqa oyundu,
Hiylələr bayquştək bəxtimə qondu.
Göyçənin həsrəti içimdə dondu,
Bu axşam tək-tənha qalıb qəmləndim.

Başımdan bəlalar keçdi nə qədər,
Sinəmin altına yol saldı kədər.
Dedim Kəlbəcərdən bəlkə bir xəbər,
Dedilər gülləri solub, qəmləndim.

İtkin ellərimə matəm saxladım,
Mənə gül dedilər haçan ağladım.
Qəlbimin içində bir saz bağladım,
Dərdimi gizlicə çalıb qəmləndim.

Mən Vətən deyəndə Vətən can dedi,
Sən mənim dərdimi anla, qan dedi.
Arif Laçın dedi, Zəngilan dedi,
Qarabağ dərdinə dalıb qəmləndim.

Eldar, şadlığa da yer ayır hərdən,
Qeyrətli insanlar düşməz təpərdən.
Ömrü çal-çağırla keçən gənclərdən
Nə qədər narahat olub qəmləndim.

## HƏKİM MƏSLƏHƏTİ

### HİPERTONİYA XƏSTƏLİYİ
***(səbəbləri, əlamətləri, profilaktikası)***

"Laçın yurdu" dərgisinin ilk nömrəsinə yazdığım təbrikdə dərginin daim formada qalması üçün öz tərəfimdən əhalimizin sağlamlığına yönələn tibbi məqalələrlə çıxış etməyə söz vermişdim. Elə bu yazımla da verdiyim vədi yerinə yetirməyə qərarlı olduğumu göstərmək niyyətindəyəm.

Ulu Tanrı ilimizi fəsillərlə bölmüşdür ki, bu fəsillərin də hər birində müəyyən xəstəliklər ya üzə çıxır, ya kəskinləşir, ya da sakitləşir (remissiya verir). O cümlədən də yay fəsli üçün hipertoniya xəstəliyinin gedişində ağırlaşmaların artması xarakterikdir. El arasında qan təzyiqinin yüksəlməsi kimi başa düşülən hipertoniya xəstəliyi nədir?

Ümumdünya Səhiyyə Təşkilatının verdiyi anlayışa görə, hipertoniya xəstəliyi arterial qan təzyiqinin davamlı şəkildə xroniki yüksəlməsidir. Bəs normal arterial təzyiqin göstəriciləri necədir? Bax, elə bu göstəricilər barəsində əhalimizin, necə deyərlər, öz aralarındakı mübahisələrinə son qoymaq üçün bunları diqqətinizə yetirməyə dəyər.

Orta məktəbin anatomiya dərsliyində nə vaxtsa getmiş səhv bir fikir - normal arterial təzyiq 120-80 millimetr civə sütunudur (mm.c.st) – şüurlara hakim kəsilmişdir.

Yaradılış baxımından insanlar fərqli olduğundan onların arterial təzyiqlərinin də fərqli olmağında qeyri adi heç nə yoxdur. Normal arterial təzyiqin özünü də üç yerə bölürlər.

***optimal:*** <120 / <80 mm.c.st
***normal:*** 120-129 / 80-84 mm.c.st
***yüksəlmiş:*** 130-139 / 85-89 mm.c.st

Deməк 140/90 mm.c.st-dan yuxarı arterial hipertenziya hesab olunur. Bu gün hipertenziyadan yer kürəsində bir milyard insan əziyyət çəkir. Hər il 7.1 mln ölüm hadisəsi bu və ya digər dərəcədə arterial hipertenziya ilə əlaqələndirilir. Beləliklə, bu xəstəlik getdikcə ciddi tibbi və sosial problemə çevrilir.

Oxucular haqlı bir sual verə bilər: bəs bu xəstəliyin səbəbi nədir, hansı amillər onun yaranmasına gətirib çıxara bilər? Səbəblər məlum olduqda biz buna simptomatik arterial hipertoniya deyir və səbəbləri sıralaya bilirik.

Bu sıraya böyrək patologiyaları (qlomerulonefrit, pielonefrit, diabetik qlomeruloskleroz, böyrəkdaşı xəstəliyi və s.), endokrin sistemin xəstəlikləri (tireotoksikoz, böyrəküstü vəzin patologiyaları, şəkərli diabet

və s.), ateroskleroz, mərkəzi sinir sisteminin xəstəlikləri və s. aid edə bilərik. Əksər təsadüflərdə isə konkret orqan zədələnməsini aşkar edə bilmirik ki, bu zaman əsas səbəb kimi bəşər sivilizasiyasının doğurduğu sinir-psixik gərginliyi qəbul edirik. Və bunu hipertoniya xəstəliyi adlandırırıq.

Hipertoniyalı şəxslərin şikayətinə gəlincə bu ən çox özünü ənsə nahiyəsində göstərən başağrıları, gözün qarşısında "tor", "duman", hissi, arabir ürəkbulanma və qusmadan ibarətdir. Bəzən bu şikayətlər olmaya, yaxud az intensivlikdə ola bilər.

Şikayətlər əsasən hipertonik krizlər zamanı ortaya çıxır ki, bu krizlərə səbəb kimi psixoemosional yüklənmələr, meteoroloji amillər, həddindən çox duz və maye qəbulu, qan təzyiqini azaldan hipotenziv dərmanların qəflətən dayandırılması, alkoqol qəbulu, siqaretçəkmə, artıq bədən kütləsi.

İki tipə bölünən hipertonik krizlərin I tipi AT-in qəflətən 180-190/100-105 mm.c.st-a yüksəlməsi, baş verir. 2-3 saatadək davam edən bu tip krizlər üçün başağrıları, başgicəllənmə, ürəkbulanma, çoxlu sidik ifrazı, ürəkdöyünmə, oyanıqlıq, üzdə və dəridə qırmızı ləkələr xarakterikdir.

II tip krizlərə beyinlə bağlı simptomlar yuxululuq, əzginlik, görmənin pozulması, dezorientasiya, qusma, döş qəfəsində sıxıcı ağrılar, təngnəfəslik, boğulma, üzdə şişkinlik aiddir.

Hipertoniya xəstəliyi diaqnozu təsdiqləənndən sonra müalicəyə ehtiyac yaranır. Bəzən xəstələrimiz "dərman qəbul etməkdən bezdim", "nə vaxtacan dərman qəbul edəcəyəm" ifadələrini işlədir.

Onlara sözümüz - bu xəstəlik zamanı dərman preparatı qəbul etməmək olar. Lakin ağırlaşmalar baş verdikdən sonra, necə deyərlər, "dərman qəbuluna ehtiyac qalmır". Bu xəstəliyin ağırlaşmaları hədəf orqanların zədədlənməsi ilə əlaqədardır. Hədəf orqanlar kimi baş-beyin (ifliclər, beyin infarktı, ensefalopatiya və s.), ürək (miokard infarktı, ürək çatışmazlığı), böyrək (böyrək funksiyalarının itirilməsi), göz dibi ( korluğa aparıb çıxaran qansızmalar və s.) əsas göstərilə bilər.

Xəstələrin müalicəsi öncə sağlam həyat tərzinə söykənməlidir.

Sağlam həyat tərzi dedikdə buraya düzgün qidalanma (xörək duzunun pəhrizdə minimuma endirilməsi, yüksək kolorili qidaların məhdudlaşdırılması, bitki məhsullarının rasionda miqdarının artırılması), fiziki aktivliyi yüksəltmək, ən əsası isə sinir-psixik gərginliyi mümkün qədər aradan qaldırmaqdır.

Hipertoniya xəstəliyinin həyat üçün təhlükəli sayılan ağırlaşmalarından xilas yolu xəstələrin vaxtaşırı öz həkimləri ilə məsləhətləşməsi, həkimlərin tövsiyələrini yerinə yetirməsi, dərman maddələrini vaxtlı-vaxtında qəbul etməsindən keçir.

Sinir-psixik gərginliyi aradan qaldırmağın yolu isə səbirdən keçir desək, heç yanılmarıq.



Bu məqalənin yazılması müqəddəs Qurani-Kərimin nazil olduğu Ramazan ayına təsadüf etdi. Bu da xoş təsadüf. Nəfsimizlə mübarizə apardığımız bu ay düşünürəm ki, xəstələrimizə hipertoniya xəstəliyinin müalicəsində səbir adlı güclü dərmanla kömək edə biləcək.

**Nağdəli ZAMANOV,**
***ATU-nun dosenti***

**<u>ŞƏHİDLƏRİMİZ</u>**

## SEYİD OCAĞININ ŞƏHİD ÖVLADI



Mən onu çox yaxından tanıyırdım, çünki uşaqlığımız, gəncliyimizin ilk illəri bir yerdə keçmişdir. Seyid Həmid Xudu oğlu Xəlilov 1969-cu ildə Laçın rayonunun Qovuşuq kəndində mötəbər bir seyid ocağında dünyaya göz açmışdır. Uşaqlıqdan Vətənə, torpağa, elə-obaya bağlılıq hissi onda çox güclü idi. Xain düşmənlərimizin torpaqlarımıza göz dikdiyi zamanda Həmidin də içində düşmənlərə qarşı güclü nifrət baş qaldırdı. Həmyaşıdları kimi o da torpaqlarımızı erməni quldurlarından xilas etmək üçün 1992-ci ildə Laçın rayon polis batalyonu sıralarına qoşularaq müharibəyə atıldı. Onun döyüş yolları elə doğma Laçın rayonundan başladı. Sonrakı illərdə Kəlbəcər, Daşkəsən, Füzuli istiqamətində gedən ağır döyüşlərdə Həmidin qəhrəmanlığı dillərdə əzbər oldu. Bütün döyüş tapşırıqlarını ləyaqətlə yerinə yetirən Həmidin gülləsindən düşmənin bir hədəfi də yayınmadı.

1994-cü il aprel ayının 21-də Füzuli rayonu istiqamətində ordumuz tərəfindən düşmənə sarsıdıcı zərbələr endirilirdi. Qəflətən atılan erməni mərmisi bu gənc döyüşçünün həyatına son qoydu. Gözlərini əbədi yuman Həmidin cənazəsi Ağdam rayonunun Quzanlı kəndində torpağa tapşırıldı. Qəbri nurla dolsun!

**Saleh ŞİRİNOV**

**ZİYALILARIMIZ**

## ŞAHMAR NƏSİROV



Nəsirov Şahmar Həsən oğlu 4 yanvar 1939-cu ildə Laçın rayonunun Əhmədli kəndində anadan olub. Zəhmətkeş bir ailədə dünyaya göz açan Şahmarın atası Həsən kişi kolxozçu, anası Gülsüm xanım isə evdar qadın idi. Körpəliyi müharibə dövrünə düşən Şahmar həyatın heç də yaxşı üzünü görmədi. Müharibəyə yollanmış atası 1942-ci ildə cəbhədə həlak oldu. Bütün çətinliklərə baxmayaraq, 1956-cı ildə Laçın şəhər 1 saylı orta məktəbini əla qiymətlərlə bitirən Şahmar Azərbaycan Dövlət Universitetinin (indiki BDU) hüquq fakültəsinə qəbul olunur.

Universitetdə oxuduğu müddətdə də Şahmar özünü ən yaxşı cəhətdən göstərə bilir. Məhz bunun nəticəsi idi ki, 1964-cü ildə Universiteti fərqlənmə diplomu ilə bitirdikdən sonra Azərbaycan SSR Ali Məhkəməsində Ali Məhkəmə sədrinin məsləhətçisi vəzifəsinə təyin olunur. 1964-1969-cu illərdə Ali Məhkəmədə çalışan Şahmarı 1969-cu ildə Cəbrayıl rayon Xalq Məhkəməsinin hakimi təyin edirlər. 1971-1976-cı illərdə Xaçmaz rayon Xalq Məhkəməsinin, 1976-1982-ci illərdə isə Tovuz rayon Xalq Məhkəməsinin sədri işləyən Şahmar Nəsirov çalışdığı bütün rayonlarda gözəl insan və nüfuzlu hüquq işçisi kimi tanınıb.

1983-cü ildə doğulduğu Laçın rayonuna qayıdan Şahmar Nəsirov Laçın rayon hüquq məsləhətxanasının müdiri vəzifəsini icra edir. 1992-2000-ci illərdə Laçın rayon məhkəməsinin hakimi vəzifəsində çalışan Şahmar Nəsirov 2000-ci ildən ömrünün sonuna kimi (2005) Şuşa rayon Xalq Məhkəməsində baş məsləhətçi vəzifəsində çalışıb.

İşlədiyi müddətdə dəfələrlə SSRİ Ədliyyə Nazirliyinin və Azərbaycan SSR Ədliyyə Nazirliyinin mükafatları ilə təltif olunmuşdur. Baş ədliyyə müşaviri idi.

**NƏSR**

## YUXU

Hələ uşaqlıqdan tez-tez yollara yoldaşlıq edərdim. Bir zamanlar Laçından Bakıya və əks istiqamətdə olan səfərlərimi daha sonralar Qaxdan Bakıya olan səfərlərim əvəzləmişdi. Bir neçə il öncə, 2008-ci ilin payızında isə Bakıdan uzanan tale yolumun mənzil başı tam fərqli bir məkan, Ağcabədi rayonu, Taxtakörpü qəsəbəsi olmuşdu. Bu qəsəbədə işlədiyim 3 ilə yaxın bir zaman ərzində həyatımda çox şeylər dəyişmişdi. Özüm üçün yeni düzən qurub fərqli bir həyat tərzi yaşamağa başlamışdım. Həyatımda bəzi şeylərin anbaan, günbəgün dəyişdiyi bir dövrdə dəyişməyən bir şey vardı, mən yenə harasa gedib gəlir, daim müxtəlif yerlərə səfərlər edirdim.

Bu dəfəki yolum çox uzun olmasa da, əziyyətli idi. Bu yol çağırış üçün getdiyim "Mişni yatağı" adlanan obadan Taxtakörpüyə sarıydı. Maşın bir neçə saat günün altında qaldığı üçün içəridə dözülməz bir isti vardı. Günəş də sankı qəzəbli bir əjdaha kimi maşının şüşəsindən içəri od püskürürdü. Beynimdə tezliklə xəstəxanaya çatıb, buz kimi "Sirab" suyunu içdiyim anın xəyalını qurur və mənə narahatlıq verən düşüncələrdən qurtulmağa çalışırdım. Nədənsə həmin an bu yerlərə işləməyə gəlməklə səhv bir addım atdığımı düşünür, Bakıda hansısa klinikanın komfortlu iş otağında kondisionerin yaratdığı sərinliklə, təcili yardım maşınında, günəş şüalarının təsiri ilə qızmış dəmirin içində adamı bişirən istinin müqayisəsini aparıb özüm-özümü qınayırdım…

Taxtakörpü qəsəbəsində işlədiyim bu dövrdə müxtəlif səbəblərlə əlaqədar dəfələrlə bu barədə düşünmüşdüm. Lakin çox zaman baş verən hər hansı bir hadisə məni bu düşüncələrdən ayıraraq, olduqca çətin şəraitdə yaşayan bu insanlardan biri edirdi. Əslində mən də, burada yaşayan insanlar da heç dəyişməmişdik. Laçında da belə idik, Laçının işğalından sonra da... Onların da qırmızı rəngli məcburi köçkün vəsiqəsi var idi, mənim də. Məcburi köçkünlük həyatından doğan cətinlikləri fərqli mühitlərdə birgə yaşamışdıq. Məni müəyyən qədər onlardan fərqləndirən amil məcburi köçkünlük həyatını fərqli yaşayış mühiti və həyat tərzi ilə keçirməyim idi. İlk vaxtlar buralara uyğunlaşmaqda xeyli əziyyət çəkirdim. Ağacların belə çətinliklə əmələ gəldiyi, qışı palçıqlı, yayı qızmar günəşli bu şoran torpaqlar məndə vahimə yaradırdı. Ucsuz-bucaqsız düzəngahlarda palçıqdan tikilmiş daxallar 19 il idi ki, burada yaşayan insanların evi idi. Bir çox maddi sıxıntılar və təbii amillərdən doğan çətinliklərlə bahəm malyariya və brüsellyoz təhlükəsi də bu insanları daban-dabana izləyirdi.

Lakin bütün bu düşüncələrin fonunda elə hiss edirdim ki, həyatımda elə bir hadisə baş verəcək ki, məni üzən bu düşüncələrdən ayıracaq, bu yerlərə işləməyə gəlməklə bəlkə də həyatımda ən doğru qərarı vermiş olduğumu düşünməmə vəsilə olacaq...

Təcili yardım maşını xəstəxananın darvazasından içəri daxil olanda artıq toran çalırdı, hava bir az bürkü idi. Ağcaqanadların vızıltısından belə başa düşürdüm ki, məni qarşıda əzablı bir gecə gözləyir. Otağa keçib "Sirab" butulkasının icindəkini "Sirab" suyuymuş kimi başıma çəkdim. Yorğunluqdan ayaqlarım sızıldayırdı. Kresloya əyləşib ayağımı stulun üstünə uzatdım. Bir neçə dəqiqə istirahət etmək üçün gözlərimi qapadım...

Avtobus Bakı avtovağzalından hərəkətə başlayanda saatın əqrəbi 11-i göstərirdi. Səmanın üzərinə qaranlıq çöksə də, sayrışan ulduzlar şəhərin işıqlarıyla göz-gözə dayanmışdı. Avtobus Tbilisi prospekti ilə şəhər mərkəzinə doğru irəliləyirdi. Mən yan şüşədən şəhəri seyr etdikcə Bakının çox qəribə bir şəhər olduğunu düşünürdüm.

Şəhər çox dəyişmişdi, illər öncəki səsli-küylü, üstü bulaşıqlı, nə qədər bəzənsə də pinti və çirkin qıza bənzətdiyim Bakı, keçən bu müddət ərzində gözəlləşib naz-qəmzəli gözəl bir qız təsəvvürü yaratmışdı. Şəhər işım-işım işıldayır, hər tərəfdə səliqə, səhman sezilirdi. Şəhər kimi sanki şəhərin insanları da xoşbəxt və firavan görünürdülər. İnsanların üzündəki sevinc, təbəssüm Bakının gözəlliyi ilə xüsusi bir ahəng təşkil edirdi.

Avtobus Azneft dairəsinin qarşısından keçib Bayıl qəsəbəsinə doğru yol aldı. Yolun kənarındakı gecəqondular sökülmüş, yerində uca binalar tikilmiş, 1-ci mərtəbələrdə olan mağaza və kafelərin adları isə ingilis dilində deyil, öz ana dilimizdə yazılmışdı. Yolun sağ qolunda yeni tikilib istifadəyə verilmiş "Qələbə" metro stansiyası adı qədər də əzəmətli görsənirdi.

Məşhur Şıxov çimərliklərinə çatanda magistralın sol tərəfində ay işığının dəniz ləpələri ilə oynaşması, ecazkar dəniz mənzərəsi insanda xüsusi bir ovqat yaradırdı. Bir zamanlar dəniz hündür hasarla mühasirəyə alındığı üçün bu mənzərəni seyr etmək mümkün deyildi…

Yanımda əyləşmiş Seymur adlı 19-20 yaşlarında gənc bir oğlanla söhbətimizi də elə bu mövzu ətrafında qurmuşduq. Söhbət hasara alınmış dəniz mövzusundan tanışlıq məqamına keçəndə məlum oldu ki, bu gənc tələbədir, imtahanlarını verib tətil üçün rayona gedir.

Xülasə...

...Mən yenə səfərdə idim. Bu dəfəki səfərim Azərbaycanın qərb sərhədlərinin qurtaracağında olan rayonumuza sarı idi. Qarşıda bizi 500 km-dən artıq yol və uzun bir gecə gözləyirdi. Təcrübəmdən deyə bilərəm ki, yol nə qədər uzun olmuş olsa da, dərin yuxu onu qısaldır. Qaradağda qa-

padığım gözlərimi açarkən Bərdədən Ağdama doğru hərəkət edirdik. Bir az getdikdən sonra avtobus sürətini azaldıb magistral yoldan sağa döndü və iki mərtəbəli bir restoranın qarşısında saxladı. Əvvəllər Bakı ilə rayonlar arasında var-gəl edən avtobusların çoxu Kürdəmir rayonunun ərazisində yol boyu sıralanmış kafe və restoranlarda fasilə verərdi. Azərbaycanın qərbi ilə Bakı arasında məsafənin uzun olması, bu rayonlara işləyən avtobusların Ağdam ərazisində olan restoranlarda fasilə etməsini daha münasib edirdi. Avtobusdan aşağı enib bir az gəzişdikdən sonra yol yoldaşım Seymurla boş bir masanın arxasında əyləşib çay sifariş etdik. Hava isti olsa da, Kürdəmirdən fərqli olaraq burada dağlardan gələn sərin meh hiss olunurdu. Yolun demək olar kı, böyük bir qismini arxada qoymuşduq. Yarım saat fasilədən sonra sübh tezdən mənzil başına çatmaq arzusu ilə avtobusa doluşub, "Allah, Məhəmməd, ya Əli" deyərək yenidən yolumuza davam etdik. Mən hər zamankı adətimə sadiq qalaraq sabaha qədər yatdım. Gözlərimi açanda hava artıq aydınlanmışdı. Mənə doğma olan ecazkar dağ mənzərəsini seyr etdikcə sanki ruhum saflaşırdı. Mənzil başına çox qısa bir məsafə qalmışdı.

Şəhərin giriş qapısı artıq görünürdü. Sağ tərəfdə, dağın ətəyində görünən böyük bir quş heykəli və heykəlin sol tərəfində rayonun adı yazılmış lövhə şəhərə qədəm qoyan qonaqlarda şəhər haqda xüsusi bir ovqat yaradırdı. Giriş qapısından hardasa 150-200 metr şəhər istiqamətində, yolun alt hissəsində üzərinə "Azpetrol" yazılmış yanacaq doldurma məntəqəsinin işıqları hələ də yanırdı. Sağ tərəfdə yamacın üzərində yol boyu sıralanmış bir-birindən gözəl binalar, binaların qarşısında yaşıl zolaq kimi uzanan kiçik bağ kompleksi, magistral yolun hər iki tərəfində ardıcıl düzülmüş işıq dirəkləri, mərkəzə doğru irəlilədikcə yolun yoxuş olması, şəhərin səliqə və səhmanı bir-birini tamamlayırdı. Bu şəhərin çox keşməkeşli və əzablı tarixi olsa da, illərlə yağıların əsirliyində olsa da yenidən əvvəlki əzəmətinə qayıtmışdı. Şəhər yenidən abadlaşdırılmış, müasir tələblərə uyğun yeni bir şəhər salınmışdı. Bu yeniliklərdən biri də bizi mərkəzdə ayrı-ayrılıqda hər birinin öz mənası olan, ümumilikdə isə həm tarixi, həm də memarlıq baxımından bir-birini tamamlayan füsunkar bağlarla əhatələnmiş geniş bir meydanın qarşılaması idi. Meydanın sağ tərəfində, dağın ətəyində ucalan bir heykəl, heykəlin sağ və sol tərəfi ilə bağın giriş qapısına qədər uzanan ağaclar və göy çəmənlik insan zəhməti sayəsində yaranmış gözəlliyə təbiət ruhu qatırdı. Bağın giriş qapısının üzərinə yazılanlardan və ucalan heykəlin əzəmətindən məlum olurdu ki, bu bağ xalq qəhrəmanı Sultan bəyin adını daşıyır. Bu bağla üzbəüz meydanın aşağı tərəfində isə rayonun digər bir qəhrəman oğlu Xosrov bəyin

adına salınmış bağa çatmamış Qarabag müharibəsi zamanı şəhid olmuş Milli Qəhrəman Oqtay Güləliyevin heykəli ucalan bağ yerləşirdi. Maraqlısı isə bu üç bağı sonda, İkinci Qarabağ müharibəsi zamanı bu rayonun düşməndən işğal olunmasında qəhrəmanlıq göstərərək şəhid olmuş digər bir qəhrəmanın adına salınmış bağ və ucaldılmış heykəlin tamamlaması idi. Bunun məntiqi nəticəsi idi ki, 4 qəhrəmanın adını daşıyan bu bağları bir-birindən ayıran meydan "QƏLƏBƏ meydanı" adlanırdı…

İşıqforun yaşıl işığında hərəkətə başlayan avtobus yolun sol tərəfi ilə üzü aşağı hərəkət etdi. Hər iki tərəfində yaraşıqlı binaları olan bu küçənin sonuna az qalmış sağ tərəfdə üzərinə "Diaqnostika mərkəzi" yazılmış bina mənə çox doğma idi. Avtobus diaqnostika mərkəzini ötdükdən sonra qarşıda ucalan otel binasına çatmamış işıqfordan sağa, avtovağzala istiqamətlənmiş yola dönərək rayon avtovağzalına doğru hərəkət etdi. Bir neçə dəqiqədən sonra biz artıq Bakı avtobuslarının dayanacağında idik. Buradan respublikanın şəhər və rayonları ilə yanaşı, rayonun kəndlərinə də sərnişin daşıyan avtobuslar çıxırdı. Avtobusdan aşağı düşüb, yol yoldaşım Seymur adlı gənclə xudahafizləşəndən sonra kassaya yaxınlaşdım və kəndimizə gedən avtobus üçün bilet aldım. Avtobusun çıxmasına az qalmışdı, özümü qaçaraq kənd avtobuslarının dayanacağına çatdırdım. Avtobus Laçını tərk edib kəndimizə gedən yola çıxanda, bu yolu sanki ilk dəfədir gedirmişəm kimi bir hiss yaranırdı məndə. Yan şüşədən izlədiyim dağ mənzərəsi yol yorğunluğunu tamamən unutdururdu. Yol boyu xəyallara dalır, tarixin qara səhifələrini vərəqləyir, uşaqkən bu yolla Laçına və Laçından geri kəndimizə getdiyim zamanların xatirələri yadıma düşürdü. Bu xatirələr köhnə bir filmin keyfiyyətsiz kadrlarına bənzəyirdi. Kadrlar müəyyən bir məqama çatanda bitir və pauza yaranır, pauza zamanı isə efirdə yalnız qara rəng görünürdü...

Enişli-yoxuşlu yollardan keçib, bağlı-baxçalı kəndləri arxada qoyduqca, bu yerlərdə yaşayan insanların ata-babalarının bir zamanlar ucqar dağ kəndlərindən rayon mərkəzinə və əks istiqamətdə geri qayıdarkən maşın qıtlığından və dağ yollarının çətinliyindən necə əziyyət çəkdikləri haqda düşünürdüm. Elə bu dəm qonşu kəndimizdən bir müəllimin iclasda iştirak etmək üçün çox çətinliklə Laçına gəlib çatması və "rast maşın düşdüyü" üçün iclasda iştrak etmədən geri qayıtması barədə dillər əzbəri olan lətifəni xatırladım, üzümə xəfif bir təbəssüm qondu. Lakin artıq həmin çətinliklər son illər çəkmiş olduğumuz daha əzablı çətinliklər kimi arxada qalmışdı. Kəndlərə asfalt yollar çəkilmiş, uzun illər məcburi köçkün kimi çətin bir həyat tərzi keçirmiş bu insanlar üçün rahat şərait yaradılmışdı…

Avtobus kəndimizə yaxınlaşdıqca nədənsə içimdə qəribə bir həyəcan duyurdum. Mənim doğulduğum, uşaqkən yaşadığım bu kəndi indi daha çox sevirdim. Orda mənə doğma olan hər şey vardı. Orda babalarımın qəbri, atamın tikdikdən sonra rahatlıqla heç olmasa 5-10 il yaşaya bilmədiyi evimiz, evimizin arxasında dağ, dağın zirvəsində hər gecə yatmazdan öncə uçub gələcəyini düşünərək qorxduğum, məni vahiməyə salan "Ağ qaya" vardı. Orda evimizin hər iki tərəfi ilə dağlardan axıb gələn, evimizin qarşısında iki sevgili kimi bir-birinə qovuşan, suyu göz yaşı kimi dupduru olan dağ çayları vardı. Orda evimizin qarşısındakı alça ağacının altındakı kiçik təpənin zirvəsində balaca daşlardan və palçıqdan tikdiyim kiçicik evlər, evlərin qarşısında küçələr, təpənin zirvəsindən ətəyinə sarı Şuşa ilə Laçının arasında olan Yeddiqat yoluna bənzədərək çəkdiyim yol, o yolla sanki hərəkət edirmiş kimi qardaşımın Bakıdan mənim üçün hədiyyə alıb gətirdiyi kiçik oyuncaq maşınlar vardı. Orada mənim uşaqlığım… orada mənim qırılıb qalmış xatirələrim vardı…

Həsrət elə bir duyğudur ki... Çox uzun illər qəlbimizdə bəslədiyimiz həsrət duyğusundan sonra hər dəfə doğma olan o yerə gedərkən sanki ilk dəfədir gedirmiş kimi bir duyğu yaranır insanda.

Avtobus xəstəxananın yanından keçib, yamacla aşağı düşüb düz yola düzələndə sürücüdən saxlamasını xahiş etdim. Həsrətimin bitməsinə çox az qalmışdı… Çayın sol sahilindən kəndin birinci evi bizim ev idi. Çayı keçdikdən sonra öz həyətimizdə olacaqdım... Artıq balaca təpənin üstündə dizlərimi yerə qoyub evimizlə qarşı-qarşıya dayanmışdım. Aradan keçən bu həsrət dolu illərdə mən çox böyümüşdüm, amma o təpə necə qoyub getmişdimsə, eləcə də qalmışdı... Lakin təpədən fərqli olaraq evimiz uçurulub dağıdılmışdı. Kubikləri qaraya boyanmışdı. Həsrət dolu baxışlar və gözlərimdən yanağıma axan iki damla yaş… Qulağımı deşən cingiltili bir səsin sədası... və alo.....

- Salam həkim…. - Deyəsən tanış səsdi... - Əleyküm salam, buyurun…



- Həkim Yaqubun oğluyam, Nurəddinli Yaqubun. Atamın vəziyyəti ağırlaşıb, zəhmət olmasa gələrdiniz...

- Misir, bir azdan oradayıq, narahat olma.

Gözlərimdən axan 2 damla yaşı silib, uca bir səslə pəncərədən aşağı səslənirəm:

- Pərviz, çantanı götür, yolumuz Nurəddin yatağına sarıdı....

**Orxan CƏBRAYILOV**

**POEZİYA**

## Vahid QARAŞOĞLU



Məhərrəmov Vahid Qaraş oğlu 1951-ci ildə Laçın rayonunun Hacıxanlı kəndində dünyaya göz açıb. Ədəbiyyata böyük marağı olan Vahid Qaraşoğlu Laçın işğal olunduqdan sonra Vətən həsrətli şeirlər yazır.

### HANI

Başı ərşə çatan dağlar,
Hara köçüb, elin hanı?
Talan olub var-dövlətin,
Zər-gümüşün, zərin hanı?

Yerindəmi o bənd-bərən,
Yalçın qayan, dərin dərən?
Şair könlünə ruh verən
Xoş ətirli gülün hanı?

Vətəninə arxa duran,
Namərdlərə qan udduran.
Sinən üstə büsat quran
Qoç igidin, dəlin hanı?

Yağılar kəsib aranı,
Gen salıb dağdan aranı.
Apardı sellər Saranı,
Sara kimi gəlin hanı?

Sən iş bilən əhli-halsan,
Qanan adamlara qulsan.
Qaraşoğlu, niyə lalsan,
Şeir deyən dilin hanı?

POEZİYA



## Tapdıq QORÇULU

Tapdıq Edilxan oğlu Alxanov (Qorçulu) 1950-ci ildə Laçın rayonunun Qorçu kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra iki il komsomol işində çalışıb. 1970-ci ildən başlayaraq rayon qəzetində kiçik hekayələri, məqalələri və şeirləri çap olunub.

Hal-hazırda da bir sıra qəzet və jurnallarda vaxtaşırı şeirləri işıq üzü görən, qaçqın-köçkün taleyi yaşayan şair ağrılarını-acılarını misralara hopdurmaqla təsəlli tapır.

### Dəmirçi Abbasla deyişmə

***Tapdıq Qorçulu***
Ay Dəmirçi, xoş gəlmisən,
Dilin sözdən ayrılmasın.
“Dilqəmi” çal mən də yanım,
Sinən sözdən ayrılmasın.

***Dəmirçi Abbas***
Şair Tapdıq, sənə deyim
Mən ki, sözdən ayrılmaram.
Şeytana getmərəm yaxın,
Qəlbi düzdən ayrılmaram.

***Tapdıq Qorçulu***
Ətri gəldi xoş baharın,
Vurğunuyam düz ilqarın.
Ayrılsa da ayaqların,
Qəlbin bizdən ayrılmasın.

***Dəmirçi Abbas***
Harda şənlik, orda varam,
Öz elimlə bir nübaram.
Haram ilə yoxdu aram,
Halal düzdən ayrılmaram.

***Tapdıq Qorçulu***
Saz gələndə məclis gülər,
Tapdıq elə xoş gün dilər.
Artığını özü bilər,
Yaşın yüzdən ayrılmasın.

***Dəmirçi Abbas***
El firavan, gözəl vaxtdı,
Sözüm hər qəlbə çıraqdı.
Dəmirçiyəm, yolum haqdı,
Mən bu izdən ayrılmaram.

### Aşıq Möhübbətlə deyişmə

***Tapdıq Qorçulu***
Ovum əldən çıxardımı
Oxum daşa tuş olmasa?
Tülək-tərlan dağdan enməz
Çovğun, boran, qış olmasa.

***Aşıq Möhübbət***
Sona kəklik məskən salmaz
Hansı dağda daş olmasa.
Ala gözlər nəyə gərək
Üstə qələm qaş olmasa.

***Tapdıq Qorçulu***
Yaratdığı şəxsə fələk
Versin saf qəlb, təmiz ürək.
Cücə-plov nəyə gərək
Sifətimiz xoş olmasa.

***Tapdıq Qorçulu***
Tapdıq, etmə giley-güzar,
Ürək dostun səni qınar.
Pis-yaxşını kim tanıyar
Get-gəl tuşhatuş olmasa.

***Aşıq Möhübbət***
Dost hayına darda gəlləm,
Çağır, olsam harda gəlləm.
Hər il doğma yurda gəlləm,
Ömrə bıçaq tuş olmasa.

***Aşıq Möhübbət***
İnsanlıq ki, var dünyada,
Səni yaşadar dünya da.
Möhübbət yanar dünyada
Dostun günü xoş olmasa.

***Təqdim etdi:*** **Mötəbər CÜMŞÜDOV**

**<u>TƏƏSSÜRAT</u>**

## GECƏLƏR YUXUMDAN ÇIXMIRSAN, LAÇIN!

Gözəl bir yaz səhərinin alatoranlığında yuxudan durub, hər tərəfi dağlarla əhatə olunmuş öz doğma balaca kəndimi seyr edirdim. Həyət-bacada tək-tək adamlar görünürdü. Kimi inəkləri otlağa aparır, kimi qoyun sürülərini Böyük güneyin sinəsinə yayıb kəklikotunun xoş ətrini duya-duya Atdamının məxmər çəmənli, gül-çiçəkli yaylağına doğru üzü yuxarı, sürüdən qabaqda asta addımlarla irəliləyirdi. O tərəfdən Malqırılanın sinəsi ilə yuxarı qıvrılıb gedən cığırla naxırlar Gen dərəyə doğru baş alıb gedirdi. Topallığın meşəsindən üzü aşağı həzin bir ahənglə axıb gələn o zümrüd dərənin səsi təbiətin bu gözəllik aləmində sehrlənmiş sükutunu pozurdu. Günəşin Keşik dağının sinəsinə yayılan şəfəqləri xəyalımı o çiçəkli yaylaqların təravətli qoynuna çəkib aparırdı. Yaşıl meşələr, dərin-dərin dərələr, uca təpələr, bənövşəli, nərgizli yamaclar möcüzəli başqa bir aləmə bənzəyirdi. Səhərin təravətli havası hamını çölə, təbiətin öz füsünkar qoynuna çəkib aparırdı. Günəş öz hörüklərini Keşik dağının zirvəsindən yığdıqca, Qoyundamından üzü yuxarı dağların ətəklərində qarağat, moruq yığmağa gedən gəlinlərin, qızların səsləri eşidilirdi.

Hər gecə yuxuda sanki bir ömür yaşayıram. Yaxşı ki, röyada olsa da səninlə görüşürəm, mənim doğma yurdum. Kəndimizdən üzüaşağı əyri-üyrü dolayı yollarla Qamışlığa enirəm. Qabaqtəpənin aşağı hissəsindən qayalara çırpına-çırpına axıb gedən Şəlvə çayının nəriltisi o dərələri lərzəyə gətirir, əks sədası ətrafa yayılırdı. Üzü yuxarı Qabaqtəpənin sinəsinə min bir gözəllik verən sıx meşələr - palıd, ağcaqayın, ulas, cökə, qara-

ğac... başı buludlara dəyən dağların sinəsini bir yaraşıqlı gəlin kimi baş-dan ayağa bəzəmişdi. Ona dikilən gözləri bir anda sehrləyib özünə cəlb edirdi. Beləcə həsrətindən alışıb yandıqca bənövşəylə, nərgizlə bəzənmiş yamacların, sıx meşələrin içində gizlənən balaca məxmər talalar, ceyran-lı, cüyürlü bərələr, o səsli-küylü yaylaqlar bir-bir gözlərimin önündən ötüb keçdikcə deyirəm, - nə gözəl təbiətin varmış, Laçın! Heyif ki, qədri-ni bilmədik. Sənin dağlarından su içib, çörəyini yeyib, insanı uzun illər yaşadan havanı udub o füsünkar gözəlliyini duymayan, altında ləl-cəva-hir yatan dağları bir ovuc qızıla dəyişən namərdlər sənin zənginliyini, kö-nüllər oxşayan gözəlliyini duymadı. Eh!.. namərd nə bilir torpaq qədrini. Təki onların cibləri pulla dolu olsun... Görəsən, o pullar onları o ulu dağ-lar qədər yaşadacaqmı?!. Yox, vallah yaşatmayacaq. Onda biləcəklər ki, bir ovuc torpaq bir ovuc qızıldan irəlidi. Axı torpağı heç nəyə dəyişmək olmazdı. O, elə hər şeydi, puldu, qızıldı, ləldi, cəvahirdi. Onlar bunu har-dan başa düşsünlər... Əgər başa düşdülərsə niyə namərd oldular? Nə isə, belələri hələlik öz kefində... Mən isə düşüncələr aləminə qapıldıqca az qalıram ki, dəli olam. Birdən elə bilirəm ki, Laçın əvvəlki kimi yaşayır. İstəsəm elə sabah avtobusa oturub gedərəm. Belə duyğularla xəyallar içindən qəflətən ayılıb özümə gəlirəm və sənin yoxluğunu hiss edib kə-dərlənirəm, Laçınım! Əlimə qələm alıb həsrətimi vərəqlərə köçürürəm. Doğma yurdum, dağların qoynunda elə əzəmətlə dayanmışdın ki, səni da-ğıtmağa heç bir silahın gücü çatmazdı. Əgər sənə xain gözlə baxan olma-saydı. Səni düşündükcə düşünürəm, mənim yurdum. Beləcə hər gecə səni yuxularda görürəm. Buz bulaqlarından su içib, çiçəkli yaylaqlarını gəz-dikcə gəzirəm. Üzü yuxarı ağlı-qırmızılı maral çiçəyinin içində itib bata-bata ağır addımlarla Pirinyalına çıxıram. Qayalardan yasəmən dərə-dərə Sarıbulağın diş göynədən suyundan içib, kəndimizə doğru üz tuturam. Elə bu an yuxudan ayılıram. Çox təəssüf hissi ilə deyirəm: “Kaş yuxudan hələ oyanmayaydım. Sənin isti qoynunda hələ bir az da gəzib dolanay-dım”. Bax beləcə həsrətini çəkə-çəkə yaşayıram. Doğma yurdum, röyada



olsa da səninlə görüşürəm. Deyirəm kaş gördüyüm yuxular bir gün həqiqətə çevriləydi. Hələlik həqiqət nağılda tilsimlənib qalsa da, ümid edirəm ki, bir gün köçkünlər öz yurduna qayıdacaq. “Hər zülmət gecə-nin bir aydın səhəri var” deyiblər. O, zülmət gecənin aydınlığını yuxularda görürəm, ancaq röyada səninlə görüşə bilirəm, mənim doğma yurdum Laçın!...

**Maarif KÖÇKÜN**

ƏKS-SƏDA

## MƏNİM TANIDIĞIM AŞIQ UMBAY

Mən Aşıq Umbay adını yeniyetməlik vaxtlarımda eşitmişəm. O zaman bir televiziya kanalımız vardı, dövlət televiziyası. O televiziyanın verilişlərinin tarixini və saatını göstərən bir proqram qəzeti çıxırdı. Həmin qəzet hər kəsin evində, televizorunun üstündə olardı. Bunu yəqin ki, hamı xatırlayır. O zaman həmin televiziyada "Dastan axşamı" adlı bir veriliş gedərdi və bu verilişi səbirsizliklə gözələyərdik. Aşıq Kamandar, Aşıq Hüseyn Saraclı tez-tez o verilişdə dastanlar, ən çox da məhəbbət dastanları söyləyərdilər. Bir gün "Dastan axşamı"nda Aşıq Umbayın "Şah İsmayıl" dastanını söyləyəcəyini eşitdim. Proqram qəzetinin "Həftənin beşinci günü, saat 20:30-da "Dastan axşamı" verilişində "Şah İsmayıl dastanı" anonsu indiki kimi yadımdadır. O zamanlar qonşuların, televiziyada gedən maraqlı verilişlərə bir yerdə baxmaları Laçınımıza xas bir ənənə idi. Artıq bu ləzzətdən də məhrum olmuşuq. Yeniyetməlik çağımda axşamın tez düşməsini və verilişin başlamasını səbirsizliklə gözləməyimin də başqa həyəcanı vardı. Veriliş başlayanda Aşıq Umbayın havacatla oxuduğu sözləri xüsusi avazla da deməsindən sonra qonşularımız Əşrəf dayının, Allahyar dayının və atamın "bəh-bəh" səsləri indi də qulağımdadır. Mən Aşıq Umbayı o gün tanıdım. Düşüncələrimdə isə bir sual qaldı, - Niyə məhz Şah İsmayıl dastanı? Çünki bu dastandan müstəqilliyin, azadlığın iyi gəlirdi.

Təəssüf hissi keçirirəm ki, mən Aşıq Umbayı Laçındakı məclislərdə görməmişəm. Rayon mərkəzində yaşamağım və tezliklə Bakıya oxumağa getməyim səbəbindən Aşıq Umbay yaradıcılığına və şəxsiyyətinə bələdçiliyim məcburi köçkünlük illərinə düşdü. Bu qürbət diyarda qərib ellilərimin xeyir işlərində bir neçə dəfə Aşıq Umbayın məclisini, meydanını gördüm. Aşıq Umbay Laçın Sarı Aşıq məktəbinin ən layiqli davamçısı və ustadlarındandır.

İşıqlı, Çalbayır, yaxşı dağlıyıq,
Dağ çəkmə, ay naşı, yaxşı, dağlıyıq.
Sarı Aşıq kimi Yaxşı dağlıyıq,
Necə qandırasan salı sən, Umbay.

***(Şərahil Laçın)***

Aşıq sənətinin zirvəsində dayanan ustadın xalq tərəfindən sevilməsinin əsas səbələrindən biri də Aşıq Umbayın öz şeiriyyatını öz sazın-

da dilə gətirməsidir. Aşıq Umbay şeiriyyatına az-çox bələd olduğum üçün bunu tam əminliklə deyirəm.

Ey şair, tanıt ki, necədi bu yurd,
Sərrafı bilinməz külçədi bu yurd.
Qızılvəngdi bu yurd, Göyçədi bu yurd,
Ələsgərsən, Umbay, Alısan, Umbay.
***(Şərahil Laçın)***

Ola bilməz ki, onun "Ölmərəm", "Allah sən saxla" şeirlərini oxuyan duyğulu insan qəlbində bir sızıltı, bir ağrı hiss eləməsin. Bunlar bütövlükdə bir elin dərdidir.

Mən Aşıq Umbayın yüzlərlə pərəstişkarlarından biriyəm. Həmişə fəxrlə deyirəm ki, o mənim yerlimdir, Laçınlıdır. Xoşbəxtəm ki, bu yazını Aşıq Umbayın sağlığında yazıram. Yaxşı ki, varsan Aşıq Umbay, yaxşı ki, sazınla-sözünlə el-obanın arasındasan. Ustaddan icazə alaraq sözümü öz misralarımla bitirmək istərdim:

Hər şeyi əlindən alınan xalqın
Aşıq Umbayına dəymə, ay Allah.
Bu qürbət diyarda bu yazıq xalqın
Ozan Umbayına dəymə, ay Allah.



Mən inanıram və ümid edirəm ki, bir gün Laçınımın ən dilbər guşələrinin birində Aşıq Umbay məclisinin iştirakçısı olacam, onun "Bayram günləri" şeirində xüsusiləşdirdiyi həmin gün bayram günü kimi mənim yaddaşımda və xəyalımda qalacaq. Bunu tək mən yox, bütün Umbaysevərlər arzulayır.

**Söhrab HƏSƏNOV,**
***29 avqust 2011-ci il***

**POEZİYA**

## ÇIRAQ NƏSİBOV



Çıraq Balakişi oğlu Nəsibov 1934-cü ildə Laçın rayonunun Təzəkənd kəndində kolxozçu ailəsində doğulub. Orta məktəbi də öz doğma kəndində bitirib.

Sadə peşə adamıdır, dülgər, dəmirçi peşələrinə yiyələnib.

Erməni qəsbkarlarının torpaqlarımızı işğal etməsi nəticəsində qaçqın düşüb. Hal-hazırda Qobustan rayonunun Təklə kəndində müvəqqəti məskunlaşıb. Təqaüdçüdür.

Ötən əsrin 60-cı illərindən yaradıcılıqla məşğuldur. "Laçın" qəzetində şeirləri dərc olunub.

2003-cü ildə isə "Bakı" nəşriyyatında "Oyandım kəklik səsinə" şeirlər kitabı işıq üzü görüb.

### "Bəy" dedik

Ay həzarat, bu dərd məni öldürür,
İşbilməzlər düşmənləri güldürür.
Doğma yurdu "dığa"lara böldürür,
Hər nadana, hər gədaya "bəy" dedik.

Vətən dərdi çox ürəklər dağladı,
Anam-bacım gecə-gündüz ağladı.
Yalan, tərif gözümüzü bağladı,
Hər nadana, hər gədaya "bəy" dedik.

"Mersedes"lə çox alçaqlar öyünür,
Babaların qəbirləri söyülür.
Əsirlikdə yurddaşlarım döyülür,
Hər nadana, hər gədaya "bəy" dedik.

Zəhər oldu hər yeyəndə çörəyim,
Qəm içində inildəyir ürəyim.
Tapılmadı mənim arxam, köməyim,
Hər nadana, hər gədaya "bəy" dedik.

### Bizim qızlar

Çəmənlərin çiçəyidir,
Qızılgülün ləçəyidir.
Məclislərin bəzəyidir
Bizim qızlar, bizim qızlar.

Gülə bənzər yanaqları,
Bal, qaymaqdı dodaqları.
Xatırladır ilk baharı
Bizim qızlar, bizim qızlar.

Füzulinin qəzəlidir,
Söhbətləri məzəlidir.
Gözəllərin gözəlidir
Bizim qızlar, bizim qızlar.

Yurdumuzun sonasıdır,
Bənövşəsi, lalasıdır.
Gələcəyin anasıdır
Bizim qızlar, bizim qızlar.

**Elmir QƏNBƏR**



## ƏLİMDƏN

Tanrı mənim taleyimi, bəxtimi
Laçından çıxanda aldı əlimdən.
O həzin, qayğısız, xoşbəxt günlərin
Əlləri üzülüb qaldı əlimdən.

Vida demədim ki, tez qayıdaram,
Nə bilim ürəkdə olacaq yaram.
Allah nə vermişdi hey aram-aram,
Onu fələk vurub saldı əlimdən.

Bəxtim məni yaman yerdə sınadı,
Nə etmişdim, niyə məni qınadı.
Deyirdim ki, Vətən mənə anadı,
Anam üçün bəs nə gəldi əlimdən?!

## BİLSƏK

Düşmən qurd olsa da diz çökdürərik,
Bir amal uğrunda birləşə bilsək.
Durmaz qarşımızda nə dağ, nə dərə,
Arazlaşa bilsək, Kürləşə bilsək.

Bir həsrət yanğısı canımızdadır,
Mətinlik, məğrurluq şanımızdadır.
Azad ömür sürmək qanımızdadır,
Qələbə eşqilə hürrləşə bilsək.

Hər nadan kəlməsi qəlbimə oxdu,
Dünyanın malına gözlərim toxdu.
Bizim üçün bundan xoşbəxt gün yoxdu,
Ana yurdumuza yerləşə bilsək.

## HEYİF O SEVGİYƏ…

Kövrək idi, həssas idi ürəyim,
Xəyalımdan böyük idi diləyim.
İstəyimə qənim çıxdı mələyim,
Heyif o sevgiyə, o məhəbbətə.

Onun üçün gizli, aşkar yanardım,
Onsuz əzilərdim, onsuz sınardım.
Ona görə özümü də danardım,
Heyif o sevgiyə, o məhəbbətə.

Qədərimə, kədərimə bax indi,
Xeyri nədir gözlərini sıx indi?!
Sənə yaddı, amma mənə yaxındı,
Heyif o sevgiyə, o məhəbbətə.

Hər ötən zamanı düşünəndə mən,
Ürəyim astaca ağrıyır hərdən.
İndi də boylanır xatirələrdən,
Heyif o sevgiyə, o məhəbbətə.

Hisslərim üsyankar, ürəyim zəif,
Bu eşq məni on il əsir eləyib.
Elə ölənəcən deyəcəm heyif,
Heyif o sevgiyə, o məhəbbətə.

**POEZİYA**

## ZAHİR LAÇINSIZ

İbrahimov Zahir Şükür oğlu 1938-ci ildə dağlar gözəli Laçının Arduşlu kəndində dünyaya göz açıb. 1956-cı ildə Pirallahı adasındakı 186 saylı orta məktəbi bitirib. 1957-1960-cı illərdə əsgəri xidmətdə olub. 1964-cü ildə APİ-nin (indiki ADPU) tarix fakültəsinə daxil olmuş, 1969-cu ildə isə həmin institutu bitirmişdir.

Bir müddət Dağlıq Qarabağın Xankəndi şəhərində yaşamışdır. 1988-ci ilin dekabr ayında erməni fitnəkarlığı nəticəsində ailəsi ilə birlikdə Xankəndindən çıxarılmışdır. Həmin vaxtdan 1992-ci ilin may ayının 9-na qədər Şuşada yaşamışdır. Qaçqınlıqdan sonra Qaradağ rayonunun Sənqəçal qəsəbəsində məskunlaşıb.

2001-ci ildə "Bu belə dünyadır" adlı şeirlər kitabı çap olunub.

### LAÇINIM

***Laçınım - Vətənim, keç günahımdan,***
***Çovğunun, tufanın eyləyəndə qan,***
***Qurumuş dilimlə sənə bir zaman***
***Viranə qal, xaraba qal demişəm.***

Düşmüşəm dərd adlı dumana, çənə,
Yetməyib uzanan əllərim sənə.
Sənsizlik elə dağ çəkibdir mənə,
Hər ağrıya, hər əzaba dözüb mən
Bir də sənə xaraba qal demərəm.

Naçar baxam sel-su gedən dərəyə,
Çaldığım ot layda qalıb çürüyə.
Qəm üstümə qoşun-qoşun yeriyə,
Hər ağrıya, hər əzaba dözüb mən
Bir də sənə xaraba qal demərəm.

Ot qarışıq tar apara atımı,
Sazaq gəlib keçə yeddi qatımı.
Əvvəlki tək yerə atıb çatımı,
Hər ağrıya, hər əzaba dözüb mən
Bir də sənə xaraba qal demərəm.

Bəxt tərlanım çıxıb əldən uçanda,
Ayla yağıb, hərdən hava açanda,
Yıxıldıqca mal dalınca qaçanda,
Hər ağrıya, hər əzaba dözüb mən
Bir də sənə xaraba qal demərəm.

Mat qalmalı işə düşüb mat qalım,
Qurtarsın ot-saman, pozulsun halım.
Qışın ortasında ac qalsın malım,
Hər ağrıya, hər əzaba dözüb mən
Bir də sənə xaraba qal demərəm.

İlan çala, əqrəb çala əlimi,
Çıxardalar kürəyimdən dilimi.
Sovuralar göyə ocaq külümü,
Hər ağrıya, hər əzaba dözüb mən
Bir də sənə xaraba qal demərəm.

Qəm selinə düşmüş üzük qaşıyam,
Ömrü boyu qəm şələsi daşıyam.
Daşdan daşa dəyə-dəyə yaşayam,
Hər ağrıya, hər əzaba dözüb mən
Bir də sənə xaraba qal demərəm.

Kötük yaram düyün-düyün yarıqsız,
Mal otaram ayaqyalın, çarıqsız.
Qan aparan yaram qala sarıqsız,
Hər ağrıya, hər əzaba dözüb mən
Bir də sənə xaraba qal demərəm...

***Sənqəçal, 2001-ci il***

## UNUTMA!

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib.

İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür.

Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.



| | |
|---|---|
| 1.Xocavənd | 18.02.1992 |
| 2.Xocalı | 26.02.1992 |
| 3.Şuşa | 08.05.1992 |
| 4.Laçın | 17-18.05.1992 |
| 5.Kəlbəcər | 03-06.04.1993 |
| 6.Ağdərə | 17.06.1993 |
| 7.Ağdam | 23.07.1993 |
| 8.Cəbrayıl | 18.08.1993 |
| 9.Füzuli | 23.08.1993 |
| 10.Qubadlı | 30-31.08.1993 |
| 11.Zəngilan | 29-30.10.1993 |

**Laçın yurdu, №2(2), 2011**

**Bakı, "Nurlar", 2011. - 96 səh.**

Dərgidə **www.az.wikipedia.org**
saytının materiallarından da istifadə olunmuşdur.

Nəşriyyat redaktoru: **Suğra OSMANOVA**
Kompüter və dizayn: **Araz YAQUBOĞLU**
Texniki redaktor: **Rauf KƏRİMOV**
Səhifələyici: **Fəxri VƏLİYEV**
Korrektor: **Elnur İRƏVANLI**
Operator: **Cəlal ARİFOĞLU**

NURLAR
НЯШРИЙЙАТ-ПОЛИГРАФИЙА МЯРКЯЗИ

Бакы, Az1122, Зярдаби пр. 78 / Тел: 4977021
Faks: 4971295 / E-почту: office@nurprint.com

Yığılmağa verilmişdir: **01.08.2011**
Çapa imzalanmışdır: **30.09.2011**
Nəşrin ölçüsü:**70x100, 1/16**
Fiziki çap vərəqi: **6,0**
Sifariş: **№192/11.** Sayı: **500** ədəd, Qiyməti: **2 AZN**

Dərgi **"Nurlar"** nəşriyyat-poliqrafiya mərkəzində çap olunmuşdur.